# Molla Nəsrəddin



# ملّا نصرالدّین


**Hazırladı: Cavid Ağa**

**اغآ دیواج :یدالرضاح**

ملا نصر الدين

№22 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 22




О.И.Шлинг

**Семъ убѣжденій**

**Yeddi mәslәk.**



## ƏDƏBİYYAT

Ey könül! Aç didəni, hər yana bax!
Əsrə bax, ovqata bax, dövrana bax!

Bir dayan Təbrizə bax, Tehrana bax!
Əlqərəz, İrana bax, virana bax!

Rəştə bax, Qəzvinə bax, Kaşanı gör,
Məşhədə, Şiraza bax, Kirmanı gör.
Ənzəli, Buşəhrə bax, Zənganı gör.

İsfahana qıl nəzər, Gilana bax!
Əlqərəz, İrana bax, virana bax!

Baxgilən məşrutəyə, hürriyyətə,
Alimə, alimliyə, ünsiyyətə,
Hiyləyə, təzvirə, iblisiyyətə,

Sora da bir firqeyi-şeytana bax!
Əlqərəz, İrana bax, virana bax!

Gör nə meydangir olubdur köhnələr,
Hər biri bir əjdaha, bir nərrəxər,
O nə əmr eylər, bu nə ifa edər,

Hakimi-Gilana bax, Tehrana bax!
Əlqərəz, İrana bax, virana bax!

Gah olur, iranlılar məşrutəçi,
Etidaliyyun, gəhi məşruəçi,
Əsl istibadadçı, məxrubəçi,

Müctəhid, mollanı gör, əyana bax!
Əlqərəz, İrana bax, virana bax!

Gəh mücahiddir görürsən qəhrəman,
Gahi bir cəlladi-zalim, şarlatan,
Gah elə, gahi belə, gahi filan.

Məsləkə, imana bax, vicdana bax!
Əlqərəz, İrana bax, virana bax!

Təsliyətbəxşa deyil yarın işi,
Daxilü xaricdə əğyarın işi,
Düz deyil hətta Sipehdarın işi.

Məmləkətdə kanə bax, kankana bax!
Rusa bax, İngiltərə, Almana bax!

İrticaya zidd imiş «İrani-nov»,
«Şərq» tənqid eyləyirmiş növbənöv,
Xainin eybin açırmış mubəmu.

Bağlanır yeksər qəzet, çapxana, bax!
Əlqərəz, İrana bax, virana bax!

Bu necə məşrutədir, nə əncümən?
Həp rəisi molla, əzası kühən?!
Bülbüli-şeydaları zağü zəğən,

Bənziyir bir şəhri-hiçistana, bax!
Ey könül! Bu mülkə bax, divana bax!
Daima dərdindən ol divanə, bax!
Əlqərəz, İrana bax, virana bax!

*Məşədi Sijimqulu*

## HELMİ PAŞA

Xəyalım möhtərəm oxuculara artıq başağrısı vermək deyil. Onsuz da hava istidir: nə uzun-uzadı yazmağa damağım var, nə uzun-uzadı oxumağa xalqın həvəsi var. Bir neçə söz müxtəsər ərz edib, qoyacağam qələmi yerə.

---

Bircə bunu soruşmaq istəyirəm: nə əcəb Rusiya hökuməti razı oldu ki, Helmi paşa Rusiyanın müsəlman şəhərlərini gəzib-dolansın, müsəlmanlarla görüşüb-danışsın? Qəzetələrdən məlum oldu ki, Helmi paşa Peterburqun müsəlman camaatının içində oldu, onlarla qonuşdu, sora Moskvaya, Kazana, Orenburqa və Samaraya getdi və müsəlmanların başçılarının məclisində söhbətlər elədi, nitqlər oxudu. Buna nə əcəb Rusiya hökuməti razı oldu?

---

Cavab:

Cavabı budur ki, Helmi paşanı Rusiya hökuməti yaxşı tanıyırmış və Stolıpin bilirmiş ki, bu kişi müsəlmanlarla nə danışa bilər. Belə olanda nəinki Rusiya dövləti Helmi paşanın səyahətinə mane olmazdı, bəlkə əli ilə bir şey də verərdi ki, bu səyahət baş tutsun.

---

İndi biz bilirik ki, Helmi paşa Peterburqda nə danışıb; biz bilirik Peterburq darülfününunda hüquq elmi oxuyan bir müsəlman qızına Helmi paşa nə söyləyib; biz bilirik ki, Kazan şəhərində müsəlman xatunlarına Helmi paşa nə deyib. Babalı Əbdürrəşid İbrahimovun boynuna, əgər rəvayət doğru olsa, halal olsun Helmi paşaya o çörək ki, müsəlmanların səmimi dostu «Novaya vremya» qəzetəsinin sahibi Suvorinin xanəsində yeyib. Məlumdur ki, əgər Suvorin bilsə idi ki, Helmi paşa müsəlmanların gözlərinin açılmağına bais olan bir kəlmə söz danışa bilər, nə Helmi paşanı evinə qonaq çağırardı, nə də onun Rusiya torpağına ayaq basmağına izn verərdi.

---

Havalar istiləşib, çox yazı yazmaq olmur. Helmi paşa Türkiyənin sabiq sədri-əzəmidir. Çox əcəb, bəs onun mənə nə dəxli var? Bəs, mənə dəxli yoxdur, niyə damın üstünə çıxıb çığırıb, hələ qonşuları da çağırıram ki, «adə, durmayın, çıxın dama, Helmi paşa gəlir». Dəxi mənə nə dəxli var, gəlir. Qoy Əbdürrəşid İbrahimov sevinsin.

Amma bu gün hava çox istidir.

*Molla Nəsrəddin*

---

## TƏZƏ MÖCÜZƏ

A Molla əmi, sizi and verirəm Hacı Mirzə Əkbər ağanın Ömər Xəttab ilə olan ədavətinə, təzə qazinin şöhrətinə, həkim Əlinin təbabətinə, Mirzə Əsgərin səxavətinə, Soltanovların insaf-mürüvvətinə, bizim sudyaların ədalətinə, cavan Əşrəfin cavanlara olan məhəbbətinə, mənim bu neçə kəlmə ərzimi jurnalınızın mübarək olan sütunlarında dərc edəsiz.

Bizim Qazizadə Hacı Axund Məhəmməd Məkkəyə təşrif aparan vaxtında Mədineyi-münəvvərədə rəsulixuda əleyhissəlamı ziyarət edəndə Hacı Axund Məhəmmədə bir dənə əba əta ediblər. İndi cənab Hacı Axund haman əbanı götürüb Məzrəə kəndinə öz evində qoyubdu bir dənə sandığın içinə. Mahalda hər nə qədər naxoş, şikəst, kor adamlar var, gəlib haman əbanı ziyarət edəndə şəfayab olurlar bəizni-Allahtaala və əlavə cənab Hacı Axund, Cəbrayıl əleyhissəlamdan vəhy gətirir.

Bu əhvalata bizim babi, sünnilər inanmırlar, rişxənd edirlər, kişiyə heç nahaq yerə yalançı deyirlər. Xülasə, bu barədə cəmi müsəlman qardaşlara elan edib xəbərdar edirəm ki, naxoş olan adamlar gəlib haman əbanı ziyarət edib şəfa tapsınlar. Məbada ki, bu işə şəkk gətirəsiniz, kafir olub qəzəbi-ilahiyə düçar olarsınız.

Adres: Böyük Məzrəə kəndində Hacı Axund Məhəmməd Qazizadə.

*İmza: Gözü ilə görən*

---

## ELAN

Mən, 1907-ci ildə Naxçıvanda ikinci dəfə olaraq açılan «İrşad» qiraətxanasının sərkarı və dəftərdarı kəmali-ehtiram ilə möhtərəm üzvlərə məlum edirəm ki, qiraətxana Allah rəhmətinə getdikdən sora oranın müxəlləfatının nə olub-olması bu qərar ilədir: ortalıq böyük stolu bir meyxana dükanına satıldı və jurnallar put-put əttar dükanlarına satılıb içlərində hamamlara həna daşındı, stolun üstünün mahudundan çılpaq üzvlərə paltar tikildi, çıraqlarını məscidlərə payladım. Ancaq dükanımda qalan bir lampə ilə beş-on cild köhnə kitab və bir süpürgə bu günlərdə Qapan meydanında Nurməhəmməd əminin hərrac dükanında mövqeyi-füruşa qoyulacaqdır. Vüsul olan pulları Halvaçıbazarda Məhi əminin dükanında təhsil tapan beş-altı nəfər şagirdlərə məsrəf olunacaqdır. Xahiş edənlər buyura bilərlər. Möhtərəm üzvlərdən rica edirəm ki, elanın indiyə qədər yubanmağını əfv eləsinlər. Bir də qaldı ki, yuxarıda satılan şeylərin pulunun hesabına heç kəs yetişə bilməz. Lazımi yerinə xərclədim.

*Dostunuz qiraətxanaçı*




**Tehranda məclisi-millidə. Təbriz vəkili Şeyx Məhəmməd Xiyabaninin Tiflis səfəri**

– Bay, bay, burada muzik çalınır. Məni niyə bura gətirdiniz? Mən qaçıram.




Etidaliyyun partiyası.
- Nə vaxt bir qüvvətli partiya çıxacaq ki, bu yatmış arabanı bir tərəfə çəkib xilas etsin.

## DUXAN

Bir neçə gün bundan qabaq Bakıda qaradavoylar görürlər ki, bir duxandan söyüş və yumruq səsi gəlir. Elə bilirlər ki, duxanda lotular keyflənib dava eləyirlər, amma içəri girib görürlər ki, bura «Nicat» cəmiyyətinin idarəsidir. Belə məlum olur ki, bu gün ümumi iclas imiş və həmin məclisdə üzvlərin biri soruşub ki, nə səbəbə indiyədək «Molla Nəsrəddin» jurnalının 29 manat 554 qəpiyi sahibinə göndərilməyib. Xəzinədar cavab verib ki, «Mollanın pulu yeyilib». Kim yeyib, məlum deyil. Necə ki, məlum deyil? Bəli, məlum deyil. Biri belə deyib, biri də elə deyib, axırda yumruq döyüşü düşüb və cənab sədr İsa bəy Aşurbəyov o qədər hirslənib ki, az qalıb bihörmət söz danışsın, amma kişi səbr eləyib və «köpəkoğlu» ləfzindən savayı artıq bir söz söyləməyib (yəni, Bakıya bu da bərəkət).

Qaradavoylar ağaları aparıb bir gecə padvalda saxlayıb səhər ötürüblər.

*Dəmdəməki*

## ELAN

Təzə açdığım qumarxanaya qəbul edirəm hər cür qumarbazları, şərt pulu olsun. Yer pulunu da ucuz eləmişəm, saatda bircə manat. Pulu qurtaran şəxslərin əgər gümüş toqqası, saatı olsa, qəbul edirəm.

Qumarxanamız açıqdır sabah saat altıdan axşam saat səkkizə kimi. Xahiş edən bu adresə rücu etsin: Zaqatala, Ter Osipovun bağı. Usta Nəsib Qafarov.

## 5 NƏFƏR

Bu salari-milli Bağır xan çox maşallah, zorba adam imiş. Doğrudur ki, bu iranlılara Allah-taala qabiliyyəti palanduz ilə təpibdir, özgələrin sərkərdəsi ancaq sərkərdədir və qoşunkeşlik işlərindən başqa özgə işə baxmaz, amma İranda salari-milli Bağır xan həmi mücahiddir, həmi də natiqdir. Bu yavıq vaxtlarda salar cənabları Tehranda bir məclis qurub və özü də bir nitq söyləyib və deyib ki, «bizim məclisi-millidə 5 nəfər vəkil var ki, anarxistdirlər, gərək o vəkillər öz xoşları ilə məclisdən çıxalar. Çıxmasalar, mən tökülüb onların evlərini yandıracağam».

***

Genə yaxşıdır ki, salari-milli 5 nəfər vəkilin çıxmağını tələb edir, yoxsa Məhəmmədəli Mirzə məclisi topa tutanda 9 nəfər vəkilin çıxmağını istəyirdi. Hərçənd ki, salar cənabları keçən günləri yada salır, amma genə Allaha şükür ki, təfavüt var.

Genə təfavütü çoxdur.

*İmza: Adaş*

## NAMƏHRƏM

Bundan bir neçə gün müqəddəm Əliabad uçastkasında Mosul kəndində on yeddi yaşında bir uşaq can üstə imiş. Dördüncü günü uşağın atası gedib molla gətirib Quran oxusun. Molla gəlib oturub Quran oxuyan vaxt uşaq dilə gəlib deyib: «Ah, mən nə uzaqlara getmişdim». Fağır molla bir qədər duruxub deyir: «Hara getmişdin?» Deyir: «Cənnəti, cəhənnəmi gəzdim, gəldim». Deyir: «Cənnətdə kimi gördün?» Cavab verir: «Ağsaqqal, yaşıləba, qırmızıqurşaq əfəndilər əyləşmişdilər, qabaqlarında süfrə, üstü min cürə nemətlərlə zinətlənmişdi. Hurilər, qılmanlar, əl bağlayıblar, əmrlərinə müntəzir idilər.» Molla bunu eşidib manatdan əli çıxmağını unudur. Sual edir: «Cəhənnəmdə kimi gördün?» Cavab verir: «Cəhənnəmdə anamı gördüm, dedim ana sən burda nə qayırırsan? Dedi, balam, mənim üzümü o dünyada çox naməhrəm kişilər görmüşdü, onun əzabını indi çəkirəm».

Ay canım, deyirsiz arvadlara da hürriyyət lazımdır. Görmürsünüz ki, cənnətdən, cəhənnəmdən nə xəbər gətiriblər?

*Allah bəndəsi*

## QEYDKEŞLİK

İran Culfasında açılmış məktəb şagirdlərinə Hacı Səttar cənabları libas alacağını vədə etmişdi və şagirdlər də neçə müddət idi gözləyirdilər ki, Hacı babaları mərhəmətə gəlib onlara libas alacaq. Amma axırda «səbir tək gəldi» və Hacı məktəb şagirdlərinin libas pulunu mütrüblərə verməyi məsləhət gördü. Çünki məktəb şagirdinin canı çıxıb çılpaq da məktəbə gedə bilər. Amma mütrübün təzə və zərif libası olmasa Hacı, məşədi və kərbəlayılar ona mail olmazlar. Bu da ki, insafdan kənardır. Odur ki, Hacı Təbrizdən gələn mütrübləri gecə sabaha qədər evində «zanit» eləyib otuz tümən pul veribdir.

Doğrudan da Hacı çox qeydkeş adamdır. Allah Hacıya ömür versin. Amin.

*Xəbərçiniz: Kərtənkələ*

*Culfa 28 may*

## QAFQAZ XƏBƏRLƏRİ

Göyçay, May ayının birində buraya 12 nəfər dərviş gəldi.

Dörd nəfəri qaldı burada, qalanı dağıldı kəndlərə ki, kənd camaatını da feyziyab etsin.

**«Molla Nəsrəddin» idarəsinə:**

Təvəqqe edirəm keçən nömrənizdə dərc olunan 11 may tarixli Ağdaşdan yazılmış «Rəfi-iştibah»ın imzasın təshih edəsiniz. Çünki imza sizə yazılmış Hacı Ə.V. Ə.V.-ov. Amma siz yazmışdınız Hacı V-ov. Ona binaən haman imzada qeyri adam var, amma həmişə məktəblər tərəfdarı olub millətə xidmət edir. Təvəqqe edirəm ki, haman sizə yazdığım «rəfi-iştibah»ın imzasın düzəldəsiniz.

*Müxlisiniz: Qəlyanboğaz*
*Ağdaş 27 may*

## QUYRUQLU ULDUZDAN MƏKTUB

Cənab Molla əmidən xahiş edirəm ki, mənim bu məktubum məcmuənin səhifələrinin birində çap olunsun. Bir neçə vaxt bundan qabaq yerdə yaşayan insanların arasına bir belə söz düşmüşdü ki, guya mən, yəni quyruqlu ulduz may ayının 6-da quyruğum ilə yeri vurub dağıdacağam. Amma indi insanlar görürlər ki, bu söhbətlərin hamısı yalana çıxdı.

Mən bu xüsusda istəyirəm bir neçə söz danışam.

***

Doğrudur, mənim fikrimdə idi ki, dünyanı bərbad edəm, çünki insanların günahı o dərəcədir ki, xudavəndi-aləm mənə bir neçə dəfə tapşırmışdı ki, bir gün fürsət tapım və quyruğumun ucu ilə yeri altı üstünə çöndərim. Bir neçə dəfə bu fikrə düşmüşəm, amma mömin şəxslərin duası və istiğa səsi məni bu işdən geri qaytarıb.

Bu keçən may ayının 6-da vaqeən elə az qalmışdım yerə toxunam, amma bari pərvərdigara mane oldu və qoymadı. Mən dəxi bu dəfə səbr eləmək istəmirdim və hətta Allahın dərgahına üz tutub bir az acıqlı dedim: «Xudaya, bir de görüm məni ələ salmamısan ki?» Bir qədər keçməmişdi ki, təzəkəndli mərhum Hacı Xudaverdiyə təyin olunan məlaikə səmadan bu məzmunda bir namə gətirdi: «Ay quyruqlu ulduz, səbr elə, günahkarların günahından keç, bu dəfə də onları bağışla həştərxanlı Molla Səttara».

Kağızı oxuyub üzümü çöndərdim Həştərxan vilayətinə və gördüm ki, doğrudan da üzündən müsəlmanlıq nuru yağan və gözündən kəsalət şirəsi tökülən bir məlaikəsifət molla minbər üstündə qəzetlərə lənət oxuyur.

Bu imiş Axund Molla Səttar.

Dəxi bu dəfə də bunun xatirəsi üçün yeri dağıtmadım.

*Müxlisiniz: Quyruqlu ulduz*

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

Möhtərəm oxucularımıza lazım bilirik xəbər verək ki, bundan sora bir neçə vaxt jurnalımızda əlahiddə elan vərəqələri çap olunmayacaq.

## ELANLAR

**Şimdilik hər pənc-şənbə  nəşr olunur**

**Tapmaca (bu qəzetənin adı nədir)**



Rotter

– Aha, çox yaxşı oldu. Mən elə bilirdim ki, bircə bisavad mənəm, amma bu mollalar da oxuya bilmirlər.

17 cəmadiəlaxir 1328 Beşimci il 13 июня 1910 г.

ملا نصرالدين

№23 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 23




– Bala, utanma, gәl yaxına müdәrris әfәndi sәni tәbrik elәsin.
Не стыдисъ сынъ мой, иди по-ближе пустъ «отецъ» освятитъ тебя.

Litoq. S.Bıxova

## İT BAXANDAN

Tiflisdə bizim məhlədə bir bağ var, adı Bataniçeskidir. Kişilər deyirlər ki, bu bağ bahar vaxtı cənnətin bir guşəsinə oxşayır.

Amma mən yazıq hələ indiyə kimi bu bağı görməmişəm; ərim qoymur ki, mən oraya gedəm; ərimdən iznsiz də getsəm yaxşı olmaz. Əvvəla, ərimi aldatmış olaram, ikinci də ki, ərim xəbərdar olsa, gəlib məni vurub öldürər.

---

Bu bağ bizim evimizin yanındadır. Bahar daxil olan kimi küçəmizdə iynə salmağa yer olmaz. Elə adamdır ki, dəstə-dəstə gəlib qapımızın qabağından keçirlər Bataniçeski bağa. Gedənlərin çoxusu da bizim kimi arvadlardır. Amma müsəlman arvadı deyillər, rus arvadlarıdırlar, erməni, gürcü, yəhudi, firəng arvadlarıdırlar. Müsəlman arvadı yoxdur, çünki kişilərimiz bizə izn vermirlər.

Bir gün evdə oturmuşdum, gördüm ki, kişi hazırlaşır getsin Bataniçeski bağa. Dedim, ay kişi, nə olar ki, bir məni də aparaydın, orada qəribə-qəribə gül və çiçəklərə tamaşa edəydim. Axır deyirlər ki, dünyanın hər tərəfindən bura qəribə-qəribə ağaclar gətirib salırlar, nə olar ki, mən yazıq da bir oraya gedib tamaşa edə idim.

Kişi üstümə elə çığırdı ki, az qaldım özümdən gedəm.

---



İndi dəxi bilirəm ki, Bataniçeski bağlar biz müsəlman arvadlarının yeri degil. Həmişə axşamlar camaat yığışıb dolan vaxt, mən gedirəm, qonşumuzda Səkinə bacını götürürəm gedirik qəbristana orada qəbrlərin dalına çöküb, bağa tamaşa edirik.

Pəh, pəh, pəh, bağ, necə bağ! Qüdrətinə şükür ilahi, ağacların yarpaqları hərəsi bir rəng çalır, güllərin ətri insanı bihuş edir.



Belə fikirdə oturub bağa baxanda bir də görürük ki, orada gəzən camaatın içində müsəlman kişisi də görünür, çox vaxt o kişilərin içində mənim ərim də olur.

---



Axşam qayıdıb evə gələndə deyirəm: «Ay kişi, barı bir mənə de görüm, niyə bizi qoymursunuz ki, gedək orada gəzək, biz ki, çarşablıyıq, bizi kim tanıyacaq?»

Kişi mənə cavab verir:

«Çox danışma. Elə onu istəyirsən ki, biryolluq el içində mənə biqeyrət desinlər?»

---

Odur ki, axşamlar Səkinə bacımı götürüb qəbristan bəhanəsi ilə gedirik qəbrlərin dalına çöküb, xəlvətcə bağa tamaşa edirik. Pəh, pəh, nə gözəl bağdır.

Dünyada nə qədər övrət ki, xəlq olunub, cəmisi gəlib ərləri ilə bu bağı gəzib gedirlər.

Amma bizim məhlədə ola-ola, biz həsrət qalmışıq və cümə axşamlar qəlbimiz çox sıxılanda Səkinə bacını götürüb gedirik qəbristanlığa, it baxandan tamaşa edirik ki, ərimizə biqeyrət deməsinlər.

Kişilərimizin də çoxusu hərəsi bir balaca oğlan ilə bağı gəzib dolanırlar ki, ürəkləri açılsın və bizi aparmırlar ki, biqeyrət olmasınlar.

Amma nə gözəl bağ! Nə xoşbəxt insanlar!..

*«Dəli»*

---

## DƏHŞƏTLİ NİTQ

«Camaat, camaat! Vətən, məmləkət xarab oldu. Bahəmeyi-bunnan belə piş əz vəqtdən irəli, əqsəmi-mütənəvviə məktəbxanalar açmaq lazımdır. Qəzetlərin dilsuz və ürək yandıran həvadisatı insanın qulağında guşzəd olanda dər həqiqətdə vətən dər həqqində nə edəcəyini bilməyib, gözlərinin sirişki abi-neysanın suyu kimi axır».

*İmza: Fanatizm dəllalı*

*(«Həqiqət» də bic-bic sözlər yazmağa başlayıb)*

---

## GÖZÜNÜZ AYDIN

Millətin atası, mücahidlərin başçısı, məşruteyiməmləkətin rəisi Şərq və İran novruznamələrini həyasızlıqlarına görə, eləcə öz keyfi ilən məhkəməsiz-zadsız bağladı. Yəni qoca məşrutəpərəstin qabaqca da bir ağacı var idi. İstəmişdi ki, ədliyyəni də hələ də nadinclik və həyasızlığına görə bağlasın. Onlar da onun sözünə baxmadılar. Ruznamələr də bunun acıqlı vaxtında bir az füzulluq elədilər, o da bağladı. Yəni nə olar, qoca kişidir, özümüzünküdür. Məhəmmədəli Mirzə deyil ki. Acığı tutub bağlayıb. Bu barədə bir az fikir elədim ki, ey İran, ey köhnə İran! Ey iranlılar demişkən altı min il padşahlı İran, ey çox hadisələr və mənzərələr görən İran, ey qüvvətliləri qüvvətsiz edən İran, ey hər şeyi öz rəngindən döndərən İran, ey Seyid Abdullalar yetişdirən İran, ey məşrutəni əgişdirən İran, ey məslək və partiyaları dəgişdirən İran!

Molla əmi, bu tövr yazanda birdən sizin Bakı qırmızısaqqallarının dəniz qırağında yığışıb uşaqbazlıq eləmələri yadıma düşdü.

*Adaş*

---

## BAĞLARDA

Yay fəsli daxil olanda hər yanda yaylağa getmək adət olub. Kimi gedir Naxçıvanın böyük duz məkanında yayı keçirir, kimi Qarabağın Bərdə bazarına gedir.

Amma Bakının bağlarının səfası özgə yaylaqlarda ələ düşməz.

**Yəni əhali də şərtdir.**

Belə mülahizə elə ki, Bakı camaatı, ayaqları yalın, əyinlərində çərkəzi, ya tujurka, başlarında fəs, ya manapa şlyapası, yanlarında realnı paltarında öz uşaqları, əyləşiblər söhbət edirlər və hərəsi qabağına bir qalaq qum yığıb, qumu eşə-eşə danışır:

– Ax namərd dünya, görəsən kimə qalacaqsan? Gör necə igidlər torpaq altına göndərdin, hanı Nurkəndli Qasım ki, üç yüz adamı döyüb geri qaytarardı. Allah rəhmət eləsin.

Hamı: Allah atana rəhmət eləsin.

---

– Gedə, nöşün hələ onu diyirsən? Bəs sabunçulu İt Fətalıya sözün nədir ki, suraxanılıların qabağını kəsdi, döyüb qovladı, qoymadı ki, nöüt aparsınlar.

Hamı: Allah rəhmət eləsin, yaxşı yolkəsən idi.

---

– Amma rəhmətlik xala – Göyçək də igid idi. Rəhmətlik həmişə qalalıların qabağına təbil-sinc ilə çıxardı.

Allah rəhmət eləsin, Allah rəhmət eləsin.

---

– Amma şağanlı Zahid bəy də yaxşı daş atan idi. Yadınızdadırmı ki, rəhmətlik bir gün vurub mərdəkanlının gözünü çıxartmışdı.

Allah rəhmət eləsin, Allah rəhmət eləsin.

---

Söhbətdən yarım saat keçməmişdi ki, burada oturan balaca uşaqlar başladılar bir-birinin üstünə daş atmağa, ataları da tamaşa eləyə-eləyə deyirdilər: «Maşallah, mənim oğlum Kurkəndliyə oxşayır».

Söz yox ki, Bakıda olan igid özgə yanda ola bilməz. Allah bağışlasın.

*Lağlağı*




## ELAN

**Fürsətdən istifadə ediniz**

**Cəmi mömin qardaşlarımıza və möminə bacılarımıza məlum edirik ki, mağazamızda bu il nisan ayında tutulmuş və necə nəfəsi pak, qəlbi saf, mömin və dindar mollalar tərəfindən dualanmış «abi-nisan» ki, hər cür dərdlərə şəfabəxşdir, satılmaqdadır. Qiyməti çox münasibdir, xahiş edənlər bu adresə rücu etsinlər: Naxçıvan, «Molla Mücərriz».**

**Священная маиская дождевая вода изцеляетъ многие болезни, продается въ магазинъ Нахичеванского духовного правления.**




Hakim: Xalqın borcunu verməyincə aparın bunları qatın tövləyə.
Въ Персии. Должники русско-подданныхъ – Заприте въ конюшную пока не заплотятъ долга.

## RƏŞT

Keçən günə gün çatmaz, calasan günü günə! Doğrudan da, Molla əmi, belədir. Bir neçə ay bundan əvvəl adam hər nə istəyirdi edirdi. Məsələn, bir gün hökumət fərraşı salam verməyib keçəndə acıqdan rus konsulxanasının mirzəsi Paşa xan cənablarına yüzcə tümən verib rus rəiyyəti olur idi və general konsul İ.Ştriter fövrən dövlət möhürü vurub bileti təsdiq edirdi və yainki tacirbaşı Hacı Səməd Şirvani «dərə xəlvət tülkü bəy» fəqərəsi kimi kargüzarı da qılçasını qılçasının üstünə aşırıb deyirdi: Ey camaat, hərgah İ.Ştriter general konsuldur, mən də balaca konsulam...

Amma indi özgə cürdür: vərəq çönüb və gördüyün ağaclar kürəkliyə kəsilib. İ.Ştriter məzul olub getdi, onun yerinə bir təzə konsul gəldi və əvvəl biçarə Paşa xanı günahı olmaya-olmaya konsulxanadan eşiyə saldı, yəni «paşol» elədi, amma doğrudan da Paşa xanın taqsırı yox idi. Biçarə altı il konsulxanada sədaqət ilə qulluq edib sümük sındırmışdı və bu qədər vaxtda ancaq cüzi rüşvət yeyib ki, ruyi həm qırx və ya əllicə tüməndən artıq deyil.

Təzə konsul çox bidətlər istəyir qoysun. Məsələn, hamıya elan edib ki, «hər kəsin tacirbaşıdan, yəni, sözüm ağzıma, əstəğfürullah, «balaca konsuldan» şikayəti olsa, qorxmayıb gəlib eləsin. Bax bu heç keçən işlərə bənzəmir.

Neçə həftə bundan əvvəl «balaca konsul» bir naib seçdirdi və böylə deyirlər ki, konsulun xəyalı var yavaş-yavaş işləri naibə rücu eləsin, çünki yazıq «balaca konsul» ömründə «əlif by» deməyib və öz adın da yazmaq bilmir. Dərd burdadır ki, konsul rəiyyət işlərinə yaxşı baxmağa iki səhih adam müstəşar qoyub, yəni «balaca konsul»un əlini işdən çıxardıb. Deməl, yazıqların çörəyinə bais olub və bu da insafdan uzaqdır. Bunların hamısı cənab Nəcmüddövlənin yazdığına görə quyruqlu ulduzun təsiridir. Allah təzə rus rəiyyətlərinin dadına yetsin, çünki konsul onları rəiyyətliyə qəbul eləmir, heyif paşburtlara və Paşa xana verilən pullara ki, hamısı hədər getdi.

*Susmarüddövlə*

## MORĞUL ŞİVƏSİ

Bikarlıq hərçənd gözəl işdi, kar aşmaz,
Əfkara talarsan dəxi qəflət basar, aşmaz,
Leykən sənə də, molla, belə kəsb yaraşmaz,
Yekşənbə günü cümə olub «il», bazar aşmaz,
Alver elədik bəsdi, yetər, gəl yataq indi,
Bundan sora şirin yuxuya gəl bataq indi.

---

Yetdi sizə bu kəsbi-ticarət bənəhayət,
Mətlubizə çatdız, bu cahan qaldı qiyamət,
İndi dəxi yox cümə, cəmaət, nə imamət,
Beş gün qalan ömri dəxi lazımdı fərağət,
Çün künci-qənaətdə olur gənc, a molla!
Eynilə bunu göstəri şətrənc, a molla!

---

Xidmət elədiz millətə əlhəqq bekifayət,
Heç kəsdə dəxi qalmadı bir həqqi-şikayət,
Ehkami-ilahi siz ilə oldu himayət,
Təfsir elədiz ümmətə hər gündə min ayət,
Gər qədrinizi bilmədisə millət, a molla!
Mütləq görünür burda bir az illət, a molla!

---

Zəhmətləriniz cümləsi mənzuri-xəlayiq,
Məktəbləriniz hüsni-təvəccöhlərə layiq,
Asari-maarifləriniz kəşfi-həqayiq,
Məclisləriniz ameyi-tədqiqi-dəqayiq,
Yazsaq buları əldə qələm durmaz, a molla!
Təşrihinə lazım görünür az-maz, a molla!

---

Vəhşi kimi bu milləti siz eylədiz insan,
Hər yanda təcəmmö edər, elm əhlidar, ürfan,
Ərbabi-zəka, kənzi-hünər, rindü süxəndan,
Hər dürlü qiyafətdə gəzirlər, bəli nadan.
Dönmüş birisi Zeydə, biri Əmrə, a molla!
Tiryakə, kimi bəngə, kimi xəmrə, a molla!
Rəhmət oxu görsən buları şəhrə, a molla!

*........Genə o*

## BƏYANİ-TƏŞƏKKÜR

Cənab Molla əmi!

Möhtərəm jurnalınızda Nobel mükafatına nail olanların zümrəsində ətibbai-zəmanədən iranlı Hacı Həkimin ismi də yad olunduğundan bu səfər giriftar olduğum maşara illətinə zati-alilərinizin tövsiyəsi ilə digər doktorlar misilli o cənabı da dəvət elədik və onun elmi-təbabətdə yədi-tula sahibi olmağını bunlar da etiraf edib, müşarileyhin müdavasını münasib gördülər və həqir bu sayədə mövti-mühəqqəqdən xilas olub və ona binaən o cənabın haqqında rizaməndliyimi vəzifədən ədd edirəm.

*İmza: Bir nəfər çinovnik*

## TELEQRAF XƏBƏRLƏRİ

**(Xüsusi müxbirlərimizdən)**

Nuxa: Əmələyi-mövtaların tətili-məşğələ, yəni zabastovka elədiklərindən şəhərdə böyük həyəcan var: elə ki 3 mütə, 7 zövci-axər, 5 siğə, 94 nömrə, nikah (bayada) qalıb, yəni 4 gündür qeydi-dəftər olmayır.

Kəza: Əmmaməli qoçuların bu hərəkətindən həqiqi, yəni nastayaşçı qoçular qələyana gəlib, əmələyi-mövtaya tənəffür elan edib baykot etdilər.

Kəza: Göynük kəndində məğfirətfüruşlardan bir nəfər axşam birisinin evində müsafir olur. Yeyib-içəndən

sora imanına qurban olduğum adəti üzrə öz hərəmxanası zənn edib, özünü zəbt edə bilməyib və zövcünə minəlhu-rüleyn deyib. Camaat yığılıb mömin kişini rüsvayi-cahan edib, yəni haqqında cürbəcür nalayiq işləri rəva görüllər. Məsələn, belinə küpə salıb başına-gözünə də zəli salırlar, guya ki, məzlumü məsum günahkar imiş. Amma... fəqirin qabağına o cür yazılıbmış...

Sora mütəntən surətdə gətirib məhəlli-məqsudi olan mərkəzdar təliminə, yəni qoçu mehmanxanasına nəql edirlər.

**ELAN**

«Molla Nəsrəddin» idarəsi tərəfindən Bakının dava vəkillərinə xəbər verilir ki, «Nicat» cəmiyyətindən 29 manat 54 qəpiyi almaqdan ötrü Bakı suduna şikayət vermək lazım olubdur. Hər bir vəkil bu pulları «Nicat»dan almağı boynuna çəksə, pulun 25 manatını verərik ona. Qalan dörd manat 54 qəpiyi göndərsin idarəmizə.

Xahiş edənlər xəbər versinlər.

**QAX**

– Həyə, dedin qax?
– Bakı müəllimlərinin bığlarına bax.

---

**HANI**

Hanı açma çuxalarımız, uzun, qalın, letli kəsmə papaqlarımız? Paslı daban, mıx nalçalı başmaqlarımız? Hanı evlərimizi işıqlandıran sınıq, sökük, sönük piysuzlarımız? Dar, qaranlıq, zibilli, çamırlı yollarımız, küçələrimiz; bu küçələrdə əli fənərli getdiyimiz günlər? Necə oldu uzaq yollarda arabalarda çəkdiyimiz zəhmətlər? Hanı kağız aparan qasidlərimiz? Bunlar getdi, işlər dəyişildi: çuxalar gödəldi, papaqlar nazildi. Başmaqlar məst oldu, məstlər çəkmə oldu, piysuzlar elektrik oldu, evlərimizin planı dəyişildi, divarlar nazildi, pəncərələr böyüdü, günbəzlərimiz çatma oldu. Küçələrimiz genişləndi. Palçıqlar götürüldü, elektrik ilə yollarımız, küçələrimiz işıqlandı. Arabalar əvəzinə paravozlar əmələ gəldi. Altı günlük yolları altı saatda gedə bildik. Kağızlarımızı daşımağa postaxanalar icad olundu, teleqraflar təsis olundu.

Hanı köhnə məktəblərimiz? Qaranlıq, murdar, zibilli mədrəsələrimiz, dəyənəklərimiz, falaqqalarımız, Mir Qəzəb müəllimlərimiz, bədbəxt uşaqlarımız?

Bunlar göz qabağındadır: Gəncədə həmşərilər təkyəsinin cünbündəki hücrələrə get, gör nə görərsən.

«Haman əst, haman əst»*.

*Dəngəsər*

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

Möhtərəm oxucularımıza lazım bilirik xəbər verək ki, bundan sora bir neçə vaxt jurnalımızda əlahiddə elan vərəqələri çap olunmayacaq.

---

**ELANLAR**



*Tərcüməsi: Hamandır, hamandır. - *(Red. – T.K.)*




Seyid: çıxart bu saat mənim xümsümü ver.

Rotter

24 cəmadiəlaxir 1328 **Beşimci il** 20 июня 1910 г.

# ملانصرالدّين

№24 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 24




Әgәr 5 nәfәr lamәzhәb vәkil Tehrandan çıxmasalar, mәclisi dağıdacağam. Литог. С.Быхова
Выдайте мне всехъ безбожныхъ депутатовъ, иначе разрушу Меджлисъ (речь Багиръ-хана)

## BAHALIQ

İstanbulda 31 martda vaqe olan iğtişaşın nəticəsidir ki, bütün Türkiyənin hər nöqtəsində bahalıq üz verdi. Nəcəfdən yazırlar ki, cücənin biri bir manatdır.

Bu bir aşkar mətləbdir ki, İstanbul inqilabına Nəcəf şiələri qarışmaya bilməzdilər; anadan doğma hürriyyətsevən nəcəflilər məşrutə səsi eşidəndən Məcnun kimi divanə olub, əkin-tikinlərini, ev-eşiklərini boşlayıb, düşüblər çöllərə azadlıq axtarmağa.

Dəxi evdə kim qalacaq idi ki, toyuqlara dən səpsin və altlarına yumurta qoyub təzə cücə əmələ gətirsin?

Sən deyəcəksən: arvadlar.

Axı, qardaş, elə sözü danışma. Biçarə Nəcəf arvadları uşaqların tərbiyəsinəmi məşğul olsunlar, camaat işlərinəmi çalışsınlar, ingilis hürriyyətpərəst xanımlarınamı köməyə getsinlər, qız məktəblərimi açmağa qarışsınlar, yoxsa toyuq-cücə saxlasınlar?

### Vaxtları harada idi?

***

Budur ki, indi Nəcəfdə cücənin biri bir manatdır və əgər bu cür hesab eləsək ki, gündə bir nəfər müctəhidin plovuna azından üç dənə cücə lazımdır, belədə gör yazıq müctəhidlərin xərci nə qədər olmalıdır? Odur ki, Tehran hökuməti bu yavıqlarda özünün onsuz da boş kisəsindən Nəcəf müctəhidlərinə on min tümən cücəplov xərci göndəribdir və hərçənd məclisi-millidə vəkillərin bəzisi bu işi xoşlamayıb, amma bir kəsdə cürət olmayıb dillənməyə.

***

Burada biz bir şeyə təəccüb edirik. Aya görək müctəhidlər kimya elmini bilirlər, ya yox? Əgər desən ki, bilmirlər, onda bəs nə bilirlər? Halbuki ağalar bütün ömürlərini buna sərf edirlər ki, iksir vasitəsilə bir şeyi döndərib özgə bir şey eləsinlər.

Fəsli-əvvəl dər iksir və dər an bab-şeş nüqtə güftə mişəvəd. Nüqteyi-əvvəl: iksiri-maülvərd, yəni suyu gülab eləmək; nöqteyi-dövvüm: iksirüləsəl, yəni südü bal eləmək; nöqteyi-seyyüm: iksirüd-dəhi, filan və filan.

Allah şahiddir ki, dünyada heç elə elm və fənn yoxdur ki, müctəhidlər onda məəttəl olsunlar.

Bəs nə bir çətin şeydir bir para dəmiri, ya misi götürüb qızıl eləmək? Əgər bir belə iş mümkünsə, dəxi insafdırmı ki, İranın indiki kasıb vaxtında hələ ondan pul da almaq?

Doğrudur, Nəcəfdə cücə bahalanıb, cücəsiz plovun da elə bir ləzzəti yoxdur. Çox əcəb, məgər qonşudan oğurlamaq olmaz? Oğurluq da və quldurluq da bundan yaxşıdır.

– Adə, dəli olmamısan ki?.. Nələr danışırsan?

*Molla Nəsrəddin*



## GÖZƏL
### (Vaqifə bənzətmə)

Bu dünyada varsa əgər bir dilbər,
Onda bu nişanlar müəyyən gərək:
Əndamı ayinə, qəddi mötədil,
Siyah zülfü qamətinə tən gərək.

Yanağı lalə nin, baharı kimi,
Ləbləri yaqutun kənarı kimi,
Bir danə nasüftə mirvari kimi,
Başdan ayağadək ağbədən gərək.

Təmizliyə ola bir az həvəsi,
Olmaya aşiqə nazü qəmzəsi,
Soğan qoxa danışanda nəfəsi,
Amma sarımsağı azyeyən gərək.

Qövlü sadiq ola, hər feli halal,
Bilməyə ki, fitnə nədir, məkrüal,
Qultək dura qabağında nitqi lal,
Kəsilsə də başı, dinməyən gərək.

Novrəsidə – on dörd, on beş yaşında,
Eyb olmaya kipriyində, qaşında,
Əgər olmasa da ağlı başında,
Şərt budur: bəyənə Hac Həsən gərək.

*Hərdəmxəyal*

## XÜSUSİ MÜXBİRİMİZDƏN TELEQRAF

Öküzə minən Seyid Məhəmməd ağa Kürdəmir vağzalında qəşş elədi, dübarə qaytardılar Şirvana. Ağanın həyatı təhlükədədir, deyəsən islamın beli sınacaq.

*Kəblə Zeynal*

## XOLERA

Bizim şəhər Duması bizim müsəlman camaatından, ələlxüsus kasıb-kusub, əlsiz-ayaqsız, dilsiz və savadsızlardan ötrü bir vəba naxoşluğudur. Bunların əzraili də pristavın pomojniki Paşa bəydir.

Dumanın o gözlərinə döndüyüm mirzəsi və buxalteri orada nə oyun düzəldirlərsə, bizim müsəlman qardaşımız Paşa bəy qoyun sürüsü kimi yığdırır bu camaatı dəftərxanaya, bir-bir çağırır, deyir: «Çıxart, məsələn, 29 manat 16 qəpik.» «Ay bəy, başına dönüm, bu nə puludur?» «Bu filan, filan illərin naloq puludur.» «Ay canım, mən bunları keçən il vermədimmi?» «Pəh! Çox uzun eləmə, hökm belədir! Mən heç zad qanmaram.» – deyib, «Nə yemisən? Turşulu aş». Vallahı, toz göyə qalxır. Bəyin əli yorulandan sora, o, bu, minnət eləyir ki «ay sənə fəda olaq, bəy, bir zəhmət çək bunun kağızına bax dayna. Qoy yazıq bəlkə doğru deyir getsin gətirsin». Bəli, axırda məlum olur ki, elə bu məzlum doğru deyirmiş, pul hələ bildir çatıb. Günahkar burada Dumun buxalteridir ki, dəftərə bunun adın tək üççə yerdə yazıb, cürbəcür nömrələr ilə, əvvəl kərbəlayı filankəs adına, sora seyid filankəs adına, axırda da təkcə filankəs adına, sora seyid filankəs adına. Bəli, tərlə, zəhmət çək, işlə, a bisavad müsəlman qardaş, qazan, gətir Dumun mirzələri səhvən qazandıqlarını cibişdana salsın. O ki qaldı müsəlman qlasnılarına ki, gedib onlara ağ şar salmısan ha, cibin lap tərtəmiz, pak-pakizə olandan sora üzünü tut onlara deyinən: «Allah bilsin, sizin insafınız bilsin, siz bilin, əbləh qlasnılar».

*Gijirtkən*

## TELEFON

Bakıda «Nicat» cəmiyyətinin bir dəstə üzvləri «Bakı müsəlmanlarının nicatı» adında bir kitab yazıblar və o kitabın 33-cü səhifəsində soruşurlar:

1) «Nicat» cəmiyyətinin ünas şöbəsi necə oldu?

2) «Nicat»ın pansionu haraya getdi? Və o pansionda keçən ildə 30 nəfər kasıb və fəqir mütəallimlər saxlandıqları halda bu il onlar haraya getdilər?

3) «Nicat»ın idarəsində telefon nə oldu?

Biz bu suallara cavab verə bilərik:

1) «Nicat» cəmiyyətinin ünas şöbəsi dağıldı, çünki qızlar doqquz yaşa çatıb dəxi küçəyə çıxa bilmədilər, bir parası da ərə getdi, yəni burada «Nicat»ın heç bir günahı yoxdur.

2) «Nicat»ın pansionu da dağıldı və burada keçən ildə 30 nəfər kasıb və fəqir mütəallimlər «İttihad» məktəbinin uşaqları ilə birləşib küçələrdə «iris» konfeti satırlar.

3) O ki qaldı telefon, onu da sədrin qərardadına görə «Nicat»dan uzaq elədilər, bu qəsd ilə ki, iclasi-ümumidə gücsüz və tayfasız bir üzvü döymək lazım olanda telefon ilə polismeysterə xəbər verən olmasın.

*Cırcırama*

## MÜJDƏ

Molla dayı! Sənə yazıb məlum edirəm ki, bundan sora «cümə» sözü danışma, çünki müsəlmanda cümə yoxdu. Əgər cümə olsaydı, Nuxa müsəlmanları və əfəndiləri bilərdilər. Və bir neçə il bundan əqdəm ərizə verməzdilər ki, bizim cüməmiz yoxdur və ərizədə yazmışdılar: «Cənab qubernator ağa, bir cür elə ki, bazar günü tətil edək». Nuxalıların duasının bərəkətindən iş elə rast gəldi ki, heç güman eləməzdik. Padşahlıq Duması qərar qoydu ki, müsəlmanlar da xristian bazarını bayram etsinlər. Bu müjdəni tezlik ilə çap et məcmuəndə ki, nuxulu müsəlman qardaşlar oxuyub fərəhlənsinlər.

Yaşasın Nuxudakı müsəlman qardaşlar, yaşasın Nuxudakı böyük, çox böyük əfəndilər.

*Dərdmənd*

Əbdülrəşid İbrahimov

İslam mübəlliğləri

Rotter

Сонъ Ахмедбека Агаева.

Əhməd bəy Ağayevin yuxusu.

Yaponiya islamı qəbul edəndən sonra.

Будушая Япония по принятию ислама.

## TELEQRAF XƏBƏRLƏRİ

Naxçıvan – Dünən sübh poyezdi ilə Ordubaddan Ağ Seyidin uşaqları şəhərə varid olub, üç saat iqamətdən sora saat on radələrində sürət qatarı ilə Zəngəzur mahalına azim oldular. Vücudi-mübarəkləri təntənəli surətdə müşayiət elədilər.

Allah xətasından saxlasın.

---

Naxçıvan – Zaqafqaz şeyxülislamının hökmünə görə keçən gün Naxçıvan qazisi məktəb açdırmaq üçün şəhərin yaxınlığında olan Qahab adlı kəndə gedir. Camaat şeyxin gəlməyini eşidib, hamısı bir yerə cəm olub, şeyxin xütbəsinə qulaq asdıqdan sora deyirlər ki: «Cənab şeyx, doğrusu bu iş Əncümən işinə oxşayır. Hərgah düz iş olsaydı, dövlət özü açardı. Sən yeri evinizə və bizlərdən şeyxülislama salam-dua yaz və təvəqqe elə ki, bizi rahat qoysun, biz elə onsuz da ona duaçıyıq». Şeyx bir qədər fikirləşib qoyub gəlir Naxçıvana.

### ELAN

Rəhmətlik Müzəffərəddin şah Yevropa səfərinə gedəndə Naxçıvan şəhərindən keçdikdə, bir neçə nəfər adama 6 illik müddətinə xanlıq icazənaməsi vermişdi. İndi yazıb məlum edirəm ki, haman icazənamələr Müzəffərəddin şahın vəfatından sora qüvvətdən düşdüyünə və dübarə bu kağızları təzə İran hökuməti təzələmədiyindən haman xanlar xanlıqlarından saqit olub qədimki halətlərinə düşmüşlər.

Bir nəfər atstavnoy xan

## DƏLİ

«Səda»nın 134-cü nömrəsində belə bir qəsidə oxuduq:

Ey gözüm nuru, əzizim Şəhrizad,
Saxlasın hər dəm səni rəbbül-ibad!
Kağızın gəldi mənə verdim ona
Busələr, qıldı məni-naşadı şad

***

Görsün ani sənin bacıların
Layiq olsa eyləsin nəşr onu «Sad»*.

*Əldi ibn əl-Həqr Həsən Əl-Qədari*

***

Molla Nəsrəddin: Bu qəsidəni oxuyanda mən elə xəyal elədim ki, Həsən Əl-Qədari zarafat eləyir. Amma bu gün bir nəfərdən eşitdim ki, Həsən Əl-Qədari dəli olub.

* «Sad» – «Səda» deməkdir. Qafiyə düz gəlmək üçün «sad» yazılıb.

## TƏBRİZ XƏBƏRLƏRİ

Meşədə qurd az idi, ikisi də gəmi ilə gəldi. Əncüməndə on nəfər məktəbdardan, təlisçidən, islamiyyə müəssislərindən var idi, İranı satmağa kifayət eləmirdilər. Hüseyn Fişəngçi ilə Əclalülmülkü də olara yoldaş verdilər ki, yaxşı satsınlar.

---

Şəhərin nəzmiyyələrin və komissarların ki, ruslar tutmuşdular və rəisi-nəzmiyyə çox qorxmuşdu, bir gün gizlənəndən sora, əlhəmdülillah, salamat tapılıb və özü də salamatdır.

---

Bu gün bir ali məclis əyalətdə təşkil olunub Ağayi-Müxbirüssəltənəni siğə oxudular on nəfərə. O on nəfərin adları gələn post ərz olunar. Allah mübarək eləsin.

---

Ağayi-Müxbirüssəltənə bu gün hamama təşrif aparacaqdır. Əncümən əzası və Rəhim Sərraf və Əli Müsyö tapılmadı ki, bu xüsusda rəy versinlər. İnşallah, sabah bu işdə yığışıb rəy verərlər və əyalətimiz rahat və asudə olar.

---

Bittili Şeyx Səlim Rəhim xanın malından beş min tümən hökmən əyalətdən istəyir. Çün Rəhim xanın nəqd pulu yoxdur, biçarə əyalət bilmir nə cavab versin Şeyx Səlimə.

*Tambrançı*

## QƏDRŞÜNASLIQ

Molla əmi, sizin cənabınızdan təvəqqə edirəm ki, siz bu mollalara, müctəhidlərə, axundlara çox dolaşmayın, ələlxüsus bizim İranda olanlara və bizim Hacı Mirzə Həsən müctəhidə ki, Təbrizin ağalarındandır, ona çox pis söz deməyəsən. Molla əmi, əgər o pis olsaydı indiyə kimi Allah onun gözlərini kor eləməmişdi və bir də, Allaha şükür olsun, indiyə kimi ona nə olubdur? Ancaq Təbrizdən çıxardıblar, Şeblu ayağında Yusifabad kəndində Molla Həsən Üskunin evində oturub kef çəkir. Orada bir tövlə var böyük, dibində bir buzovxana vardır, hər vaxt küçədən bir səda, hay-küy qulağına gəlir, evindən durub o buzovxanada qeybəti-kübra edir, elə bilir ki, babi olan məşrutəçilər Təbrizdən gəlib bunu tutmağa. Və bir də Molla əmi, ata-baba sözüdür: «Mollaya pis demə, adam kafər olar».

Bunların hörmətini heyvanlar çox saxlarlar, bunlar

hər nə desələr və hər nə yazsalar, olar qəbul edərlər. Hətta bizim Üskuyda bir ağa Mirmahmud deyən molla var, hər evdə ki, taxtabiti olsa, bir dua yazır, daha taxtabiti o evdə görsənməz və bir də gah-gah cinləri tutar, şüşəyə salar, dəxi cin tapılmaz və bir də əlahiddə molla var idi, Allah ona rəhmət eləsin, göydə dolunu bağlardı. Bahar fəsli kəndlərdən gəlib onu aparardılar dolu bağlamağa. Əgər o olaydı Tiflisdə, o gün dolu belə böyük yağmazdı. Bunların qədrini bilmək gərəkdir.

*Üskuyi*

---

## «MOLLA NƏSRƏDDİN» İDARƏSİNƏ

Jurnalın 22-ci nömrəsində bir qəzetə adı yazılmışdı və adın üstündə balaca xətt ilə yazılmışdı: «Tapmaca».

Bu qəzetin adı nədir? Bax, mən o saat oxudum, o qəzetin adı ya «Həmaqət»dir, ya da ki, «Kamança». Amma «Hikmət» də oxumaq olar. İndi məlum oldu ki, mənim savadım hamıdan artıqdır. Ona görə xahiş edirəm ki, şeyxülislamdan təvəqqe edəsən ki, məni İrəvan Göy məscidi mövqufatına mütəvəlli eləsin. Amma oxuduğuma and olsun ki, heç xəyanət eləmərəm, lap xatircəm ol.

*Müxlisiniz: Molla Fırıldaq*

---

## LAZIM DEYİL

Bir qaç gün bundan irəli Müfti əfəndi Göyçay qazisinə hökm eləmişdi ki, Qarabaqqal kəndinə gedib orada yeni üsul ilə bir məktəb açsın.

Qarabaqqal kəndinin ruhani mollası Musa əfəndi camaatı bir yerə yığıb, başlayıb dad-fəryad etməyə ki, camaat, daha din əldən gedir. Allah xatirinə, götürün qaziyə yazın ki, bizə məktəb lazım deyil.

***

Camaat da götürüb qaziyə yazır ki, «bizə məktəb lazım deyil».

Söz yox, bəlkə də lazım deyilmiş. Məsələn, bir adama spiçka lazım olur, qeyrisinə lazım olmur. Sənə bıçaq lazımdır, amma mənə lazım deyil. Mənə qələm lazımdır, sənə lazım deyil.

İndi də tutaq ki, qeyri kəndlərin camaatına məktəb lazımdır, amma görünür ki, Qarabaqqal camaatına lazım deyil.

Dəxi niyə çox danışırsan?

S.N.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

Möhtərəm oxucularımıza lazım bilirik xəbər verək ki, bundan sora bir neçə vaxt jurnalımızda əlahiddə elan vərəqələri çap olunmayacaq.

## ELANLAR


Rəhim Sərraf
Əli Müsəvi
Siyid-əl Mühəqqiqiy
Mirzəhüseyn məktəbdar
Rəisi Nəzmiyyə
Şeyx Səlim
Şəxsi əqəlli-Azərbaycan
Rotter

1 rəcəb 1328 **Beşimci il** 27 июня 1910 г.

# ملا نصر الدین

№25 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 25



Tacirin mənzilində qonaqlıq: – Ağalar, buyurun, qorxmayın, hamını görər, üç çetvert ətin bozbaşıdır, yeyəndə «bismillah» desək hamımız doyarıq.

Litoq. S.Bıxova

## ƏDƏBİYYAT

Yatmısan, Molla əmi, gürcülər içrə hələ sən,
Nə olur ta bu müsəlmanlığa da bir gələsən,
Bakıda bir neçə gün rahət edib dincələsən
Hacılarla olasan hər gecə həmməşğələ sən
Görəsən bir para yerlərdə nə canlar var, əmu!
Necə kef çəkməyə xəlvətcə məkanlar var, əmu!

Dolaşıb bulvarı hər gün gəzəsən biminnət,
Xassə axşama qalarkən bir, iki, üç saət,
Görəsən orda neçə oğlan, uşaq, qız, övrət,
Cümləsi simbədən, zöhrəcəbin, mahtələt,
Xubru, ğaliyəmu, qönçədəhanlar var, əmu!
Özün insaf edəsən, ta necə canlar var, əmu!

Ol yerə sanma çıxır seyrə fəqət hərcayılar,
Yox, yox, orda gəzənin əksəri mömin sayılar.
Lap səníntək əmilərdir və mənimtək dayılar,
Pak, mömin hacılar, məşhədilər, kalbayılar.
Həpsinin səcdədən alnında nişanlar var, əmu!
Dəyişik donda gəzən mərsiyəxanlar var, əmu!

Cümləsi ağzı dualı, bütünü əhli-namaz,
Əldəki səbheyi-səddanələri tulü diraz,
Dilim-ağzım qurusun, şəkkə düşürsən də bir az,
Demirəm mən nə şeyidbazdı, nə də kim, beçəbaz.
Bir para çünki xəta yollu gümanlar var, əmu!
Nə işim, bəzi gümanlarda ziyanlar var, əmu!

Demirəm bulvara, bunlar nə xəyal ilə gəlir,
Kişilər bəlkə də bir başqa məal ilə gəlir.
Bu qədər var dəyişik surəti, hal ilə gəlir,
Qəmü həsrətlə gedir, dərdü məlal ilə gəlir.
Bilmirəm bunda nə əsrari-nihanlar var, əmu?!
Bildiyimcə desəm, aya inananlar var, əmu?!

*(..........)*



## TACÜL-HAC

Bəli, buna iyirminci əsr deyərlər ki, Vatikan kimi dağı da tərpətdi. Hünər bircə simsiz teleqraf icad etmək deyil, hünər bircə havaya qalxmaq deyil. Hünər bu idi ki, katoliklərin bütü mənzələsində olan və İsanın vəkili hesab olunan Rim papalarının nüfuzunu azaltmaq, katolik ruhanilərinin istibdadını pozmaq və biçarə əhalinin boynundan keşişlərin zəncirini qoparıb inkvizist günlərini min-min nifrətlər ilə yad etmək və min-min lənət ilə rəhmət oxumaq. Belə də oldu. Buna iyirminci əsr deyərlər ki, İspaniyada katoliklərin rişəsini kökündən kəsdi. Yevropa ruznamələrini mütaliə edənlər xəbərdardırlar ki, bu saat İspaniyada bərk vurhavurdur: baş vəzir Qanalixas kral ilə bərabərlikdə çalışmaqdadırlar ki, lazım olmayan katolik cəmiyyətləri qapansın, katolik məktəbləri ümumi nəzarət altına alınsın, ruhanilərin və qeyri-ruhanilərin hökumət yanında təfavütü olmasın, keşişlərdən də ümumi qanunlar üzrə vergi alınsın.

---

Ax, keçən günlər! Bir vaxt var idi ki, Rim papasının səsindən Firəngistan və İspaniya dağları titrərdi, padşahlar bac verərdilər, xristianlar uşaqlarının xörəklərindən kəsib papasların sarayı Vatikana hədiyyələr daşıyardılar. Ziyarət günləri qızıl sovqatlar dağ kimi qalanardılar. İsanın canişini-papas yığardı başına on iki nəfər həvariyyun vərəsəsi hesab olunan əshab və ənsarını, yəni on iki nəfər kardinalını və qızıl yüklərinin yarısını Vatikanın anbarlarına töküb, yarısını da paylardı «həvariyyuna», zəvvarın da hərəsinin əlinə bir tikə intuligensiya verib, behiştin yolunu nişan verərdilər ki, tez rədd olub getsinlər.

---

Oxuculardan lotu-lotuyana iltimas edirik ki, bu məqalənin yadigarı üçün, hər kəsə mümkün olsa, Firəngistanın məşhur yazıçısı Emil Zolyanın «Rim» adında kitabını tapıb oxusun.

Keçək mətləbə.

Tarix bizə bunu göstərir ki, maarif artdıqca ruhanilik hörmətdən düşür və təkbətək hər bir Avropa millətini götürsək, görərik ki, elm və fənn meydana gələn kimi ruhanilər aradan çıxıblar. Belə ki, məsələn Emil Zolyanın kitabları Firəngistanda intişar tapan kimi zehinlər bir neçə ilin içində o dərəcədə oyandılar ki, firənglər nəinki Rim papaslarının ziyarətinə getməyi tərgitdilər, hələ bəlkə öz içlərində katolik keşişlərin qalmağını artıq hesab elədilər.

Odur ki, iki qonşunun biri – Firəngistan maarifin vasitəsilə gözünü açıb, üz qoydu tərəqqiyə, amma İspaniya hələ qalmışdı qaranlıqda, çünki mətbuat hələ tənəzzüldə idi.

İyirminci əsrin bərəkətindən, bir gün oldu ki, cəmi ispaniyalılar qırmızı baydaq götürüb, «Yaşasın maarif və puç olsun cəhalət» – deyib düşdülər küçələrə: hər oğlan və qızın əlində bir kitab və milli marş oxuya-oxuya kitabı yuxarı qalxızıb deyirdilər: «Yaşasın bu kitabı yazan əl-alim-əl-kamil və əcəllül-əfzəlül fəzlül-mütəkəllimin fil-bəyan və əmələühül-vaizin lit-tibyan və əkməlül-mühəddisin beynəl-ənam və əfzəlül-mühəqqiqin fil-islam tacülhac və siracül-vəhhacül-hac Mirzə Möhsün tacülvaizin Nişaburi ləsəll», «Yaşasın bu kitabın çap olunmağına bais olan vücudi-şəriflər ki, «dər mətbəeyi-cəraidi-«Həyat» və «Kaspi» mütəəlliq becənab Hacı Zeynalabdin ağa Tağıyev behümmətü ehtimami-müdiri-idarə və kantori-cəraidi-məzkurə cənab Həsənağa Həsənov behilyeyi-təb rəsidəəst. 3 səfər, sənə 1324.

---

Bəli, sənə 1324-də səfərül-müzəffərin 3-də dünyavü aləm biri birinə dəymişdi. Rusiyada millətlər baş qaldırıb, özlərinə nicat yolu axtarırdılar. Mətbəələrdə gecə və gündüz elmə və fənnə dair kitablar tərcümə olunub çapa verilirdi; haman günlərin bir günü Mirzə Möhsün adında bir bambılı gəlir «Kaspi» mətbəəsinə və Həsənağa Həsənova deyir ki, «bir kitab yazmışam, kömək elə çap olunsun ta ki, millətimizin balalarına bir yadigar qalsın».

Çox gözəl, de görək nə yazmısan? Bəli, bax gör nə yazmışam.

| | | |
|---|---|---|
| 1929 | 467 | 437 |
| K | | 1142 |
| AH | MV | S |

Cəhəte mali-məsruqə. Əgər kəsi bexahəd ki, peyda künəd in tilsimi-əzəmra dər haman xanə dəfn künənd (səhifə 252).

Çox əcəb, mən kömək edərəm ki, kitabın çap olunsun ki, millət üçün bir yadigar qalsın, Hacının canı sağ olsun, bir neçə min manatı da qoy bu kitaba xərcləsin.

Bu həmin kitabdır ki, bir nüsxəsi gedib çıxıb İspaniyaya, orada oxuyub, birdən gözlərini açıblar və yaxşı ilə yamanı biliblər və haman tilsim vasitəsilə millətin oğrusu olan katolik keşişlərinin yaxasından yapışıb, oğurlanmış olan hüquqlarını geri istəyiblər. Bu haman kitabdır ki, 1324-cü ildə Hacı Zeynalabdin ağanın mətbəəsində Həsənağa Həsənovun hümməti ilə çap olunubdur. Bu haman kitabdır.

*Molla Nəsrəddin*

---




Пустъ невеста идетъ поближе.
Gərək gəlin bir az qabağa gəlsin.




Не уступимъ, не уступимъ, пока женихъ не поклонится.
Çox danışma, bəy baş əyməsə, gəlini verməyəcəyik.

Rotter

– Adə qoymayın, bəyin papağını götürün qaçın, xələt alarsınız.

Tiflisdə «İttifaq» məktəbinin əzl olunmuş müəllimləri. Увеленные учителя училиша «Иттифагъ» (в Тифлисе).



Bu bədbəxtliklərin hamısı quyruqlu ulduzun təsiridir. Все эти бедствия отъ кометы Галилея.

## ŞİRVAN

Hakimi-niyran, sahibi-qılman, düşməni-ürfan,
Zahiri insan, batini şeytan, xanəsi viran,
Molla Cibişdan, ağlı səbükdan, burnu badımcan,
Saqqalı əlvan, halı pərişan Molla Fisincan.

Yəni alimi-Aşqabadi Seyid Məhəmməd Şirvani bu gün Kürdəmirdən Şirvana varid oldu, canı təhlükədədir. Sanitarnı komissiya «xolera-xolera» deyib istəyirdi əhəng boçkasına bassın, lakin şükürlər olsun ki, ağanın müridləri bu işə razı olmadılar. Qərəz, ağanı mindirdilər kosa Hacı İbrahimin dalına, apardılar.

Mirzə Məhəmmədin deməyinə görə, millətin evi yıxılacaq.

*İmza: Sübhanqulu*

---

## NAXÇIVAN

Zaviyə məscidini qayırıb qurtardılar. İndi də üstünü progimnaziya üçün otaqlar saldırdılar. Allah Naxçıvan müsəlmanlarına rəhm eləsin.

---

## DƏVƏT

Məlum olsun ki, üzümüzə gələn ayın əvvəlində məktəbi-xeyriyyəmizdə imtahanlar başlanacaqdır sübh saat səkkizdən 16-ya qədər. Hər kəsin gəlib imtahanlara qulaq asmağa haqqı vardır. Bu şərtlə ki, gələndə gözlərini yumub, qulaqlarını tıxayıb, ağızlarını bağlayıb məktəbə daxil ola və illa bu şərtimizi qəbul etməyən əşxasi-zülehtiramlar məktəb qapısından içəri buraxılmırlar.

Qol qoydu: Məktəbi-xeyriyyə inspektoru bir dənə mərsiyəxan

---

## GÜRGƏLƏ

Ziddi-maarif, üsuli-cədidə müxalif olan sabiq Bakı çayçısı Hacı Molla Əli Hüseyn Şirvani Aşqabad qaziliyinə təyin olunmağına görə bir nəfər dostu tərəfindən yazılan təbriknamədir:

Aşqabada qazi olub Kürgələ,
Zülmdə Zöhhak, özü Hərmələ.
Yaxşıca tapdın biz üçün məşğələ,
Sübhü məsa məsələ, hey məsələ.
Düşdü bizim işlərimiz əngələ,
Cəmdəyi kirpi, başı kərtənkələ.

*İmza: Fazil Şirvani*

---

## MƏKTUB

Molla əmi, əlimə qələmi aldım ki, sizə bir neçə işlərdən yazım, amma bilmədim ki, hansı işdən yazım.

Məsələn: Qara Əhmədin «Nəşri-maarif» cəmiyyətinə seçilən üzvlərindən, qərəzi-şəxsi cəhətincə olan ədavətindən və narazılığındanmı» (çünki üzvlərin əksəri saqqalsızdılar), axşama kimi günün altında onun-bunun yanına gedib bu barədə izhari-ədavət etməkdənmi, yoxsa Hacı Həsən müəllimə bir qravatı qırx manata satıb, soradan, yəni indi qırx altı manat istəməyindənmi yazım?

Təvəqqe edirəm, hansı barədə xahiş eləsəniz məlum edəsiniz, sizi və möhtərəm oxucuları feyzyab edim.

*Müxlisiniz: Qəlyanboğaz*
*1910, 16 iyun.*

---

**Ağdaş, 22 iyun**

## SƏYAHƏTİM

Molla əmi! Mən bir neçə gündür ki, Şamaxıdan Kosa Hacı İbrahim tərəfindən göndərilmişəm Ağdaşa ki, camaat əgər yoldan-flandan azıb-çıxıblarsa, onları doğru yola gətirəm və Sultan Məhəmməd Xamisi taxtından düşürüb xəlifeyi-ruyi-zəmin olan Sultan Əbdülhəmidi səltənət üzərinə keçirib, əvvəlki kimi ədalət və kəsalət üzrə olaraq sultanlıq eləsin və bu işi yapmaqdan ötrü camaat arasında Kosa Hacı İbrahim tərəfindən imzalanmış bir qədər intibahnamə paylayacağam və can ilə, baş ilə kömək eləyəcəyəm. Amma, Molla əmi, bu Ağdaş camaatı qəribə bicdilər ha... Nə qədər vaxtdır gəlmişəm, tək ikicə dənə özüm kimi imana gətirmişəm. Hələ gündüzləri məsciddə namaz da qılıram ki, xalq mənim sözümə inansın, axır baxıb görürəm ki, cümləsi fasiq olublar, nə molla sözünə baxırlar, nə ağsaqqal. Bu cür yerdə dayanmaq da məkruhdur. Ona görə hazırlanmışam Şamaxıya getməyə, amma Hacı İbrahimdən qorxuram. Əliboş, üzüqara onun yanına necə gedəcəyəm? İlahi, sən burdan mənə bir neçə yoldaş yetirəsən xəcalət olmayım.

*Sizə bədxah: Hacı Məhəmməd Çirmək*
*Yazan: Qəlyanboğaz*

---

## ELAN

Yazıb hamı müsəlman qardaşlara məlum edirəm ki, hər kəs səğirə qəyyum olub onun malını, mülkünü sahiblənmək xəyalına düşsə, hər gün saat 7-dən 12-yə kimi mənim yanıma təşrif gətirsin ki, ona haman fəndi bir neçə dəqiqənin müddətində asan vəch ilə təlim edib və o işdə mahirləşdirib ərizələrini yazdırmaq üçün də bir nəfər istefa vermiş tiryaki mirzənin yanına göndərirəm. Və bu işdə öz qardaşım səğirlərinin malını, mülkünü yeyib təcrübə hasil etmişəm.

Adres: Naxçıvan, Odun meydanında bir nəfər kupes bəy

## XƏBƏRLƏR

Aşqabad – Firuzə yaylağının kupalnisində gimnazistlər ilə bərabər fitəsiz çimməkdən ötrü möminlər tərəfindən verilən ərizələri komitet qəbul eləmədi. Şəhərdə böyük həyəcan var. Eşidilməyə görə Nənə Qəfər, Kəblə Şəkər çox hirslənibləR.

*İmza: Komitetin bir üzvü*

---

Daşkənd – Məşhur misyoner Astraumov misyonerlər siyezdinə getməyinə görə, müvəqqətən yerini idarə etməyə Qazlinskidən şeytan şagird təyin olundu.

## AZƏRBAYCAN İŞLƏRİ

Şükr olsun Allaha, Azərbaycan işləri çox yaxşı idarə olunur. Tamam işlər qanuni-məşrutə ilə çox müntəzəm və mürəttəb. On iki nəfər Əncüməndə rəis Seyyidəl-mühəqqiqin, Nizamül-üləmanın oğlu, Qaraməlikdə top atan Salar Ərfə, Basmançıda şah ordusunda sursat cəm eləyən Dəbirüssəltənə və Məhəmməd Əlinin yanında... Mükərrəmüddövlənin qardaşı Seyyidəl-mühəqqiqin və müavini rəis Mirzə Hüseyn məktəbdar və xalisə sahibi və Seyid Haşım mərhumun canbirqəlb yoldaşı, təzə Firəngistandan gələn, sora təlisçi, fişəngçi, bakuçi, Hacı Mehdi kuzəçi, küpəçi, Şeyx Səlim dəyənəkçi və Seyyid Ocaq.

Bunlar gecə-gündüz məşğuldurlar siyasətə, tamam dul həmcivarın politikaların nəzərə alıb xidmət elərlər. Tamam idarələrin işlərini alıblar ələ, hətta hökumətin də cüzi və külli işlərini bunlar təsərrüf və icra edərlər. Bu büzürgüvarların bərəkətindən Xoy, Səlmas, Urmi, Savucbulaqda daha bircə kənd qalmadı ki, çapılmasın. Tamam əhali bir çörəyə möhtacdır. Bunların nəfsi-müqəddəslərinin təsiri altından bayıra çıxmaq mümkün deyil. Şəhri-Təbrizdə, divanxaneyi-ədliyyədə soyhasoydu. İyirmi nəfər nəzmiyyə və komissar ruslara təarüf göndəriblər. Əncümən əzası, maşallah, tamam məmləkət işlərin düzəldib. Mirzə Hüseyn mərsiyəxanlıq da edir, Seyyidül-mühəqqiqin əncümən rəisi öz məscidində hər gün camaat namazı qılır. Qalan əza da öz kəsbi sənətlərində çox möhkəmdirdər.

Əlhəmdülillah, Hacı Seyyidül-mühəqqiqin ağanın famili günbəgün tərəqqi elər, bir qardaşı Qaradağda rəisi-komsiyoni-qarət və neçə günlər də hakim olacaq, əmisi oğlu rəisi-nəzmiyyə və bir qardaşı da nəşri-maarifdə bəzənir ki, rəisi-maarif olsun. Hacı Nasir həzrət–Əncümən əzası çün Nazimüddövləyə nökər idi, göndərdi Ərdəbilə öz şəxsi işlərindən ötrü.

## SAQQAL

Bu günlərdə Əncümən əzası Şeyx Səlimin pul almaq səbəbinə sair əza ilə bir böyük dava olub, sora xadimlər iyirmi fund saqqal tükü süpürdülər. Lənət şeytana.

*İmza: Tambrançı*

## POÇTA QUTUSU

Qızılhacılıda müəllimdən şikayət yazana: Müəllim barəsində elə bərk sözləri yazan və yazdığı kağızı qəzetxanaya imzasız göndərən düz adama oxşamır. Hələ kağızını çap eləməkdən qabaq, bu sözləri lazım gördük çap edək.

Nuxada «Çayqırağlı»ya: Yazırsınız ki, Nuxada bir xan peyda olub, cəmi cintutanları tezcə yaxşı edir.

Biz bu sözə inana bilmərik, o səbəbə ki, cintutanları yaxşı eləmək özü bir işdir, amma bu var ki, xan iş görməz.

Bakıda «Sarsağ»a: Elə xəbərləri gündəlik qəzetlərə yazmalısınız.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*


Rotter

8 rəcəb 1328 **Beşimci il** 4 июля 1910 г.

# ملا نصرالدين

**№26 Qiymәti 12 qәpik.** **МОЛЛА НАСРЕДДИНЪ** **Цена 12 k. № 26**



İranlı: – Cәnab polismәn. Heyif ki, mәn sәnin dilivi bilmirәm. Ancaq saat buraya gәlәndә sәn dә gәl bizim İran komitәsinә vә qoyma ki, üzvlәr bir-birinin başını yarsın (Parijdә).

Litoq. S.Bıxova

## ƏDƏBİYYAT

Mürtəce xadimlərim, ha indi xidmət vəqtidir,
Yatmayın, huşyar olun, iş vəqti, qeyrət vəqtidir!

Gizli cəmiyyət yapın, məclis qurun, şura edin,
Rəşt, Zəncan irticanı hər yerə icra edin,
Hər nasılsa rişeyi-məşrutəni imha edin,
Heykəli-mənfuri-istibdadımı ehya edin.
İğtişaşa başlayın hər yerdə, fürsət vəqtidir,
Yatmayın, huşyar olun, iş vəqti, qeyrət vəqtidir!

Cəhd edin göndərdiyim təhrirlər puç olmasın,
Yazdığım, göstərdiyim təzvirlər puç olmasın,
Məmdəli Kazım tökən tədbirlər puç olmasın,
Verdiyim qövl, aldığım təqrirlər puç olmasın.
İndi isbati-hünər, sidqü sədaqət vəqtidir,
Yatmayın, huşyar olun, iş vəqti, qeyrət vəqtidir!



Sanmayın ancaq Ədesdə kefdəyəm nisvan ilə,
İrtibatım yoxdur öz mülküm olan Tehran ilə.
Lafəv Allah var əlaqəm büsbütün İran ilə,
Rəşt ilə, Qəzvin ilə, Kirman ilə, Zəncan ilə.
Mən işi qaldırmışam, sizdən də himmət vəqtidir,
Yatmayın, huşyar olun, iş vəqti, qeyrət vəqtidir!



Sanmayın azdır bu gün İranda əvanım mənim,
Ev başı hər yerdə var minlərcə dərbanım mənim.
Onlara sadir olur hər anda fərmanım mənim,
Mən bu yolda işdəyəm, var hər qədər canım mənim.
Leyk sizdən də mənə indi həmiyyət vəqtidir,
Yatmayın, huşyar olun, iş vəqti, qeyrət vəqtidir!



Bax, nasıl İran bu saat haləti-böhrandadır,
Parlaman heyrətdə, əza-mərəzi tufandadır.
Qanmayır heç kəs ki, kəşti qanda, dərya qandadır?
Müxtəsər, hər vəchilə məşrutə min nöqsandadır!
Etməyin qəflət, bu fürsətdən qənimət vəqtidir,
Yatmayın, huşyar olun, iş vəqti, qeyrət vəqtidir!

Görməyirsizmi kişi gah söz, gah istefa verir,
Xeyrsizmi mənsəbindən əl çəkir, yekca verir,
Ya Nəcəfdən müctəhid müftə məgər fitva verir?
Sanma bu fitvaya bihəqqüləməl imza verir.
İş aparmaqçın bu gün dünyada fürsət vəqtidir,
Yatmayın, huşyar olun, iş vəqti, qeyrət vəqtidir!

..........

---

## HALAL KƏSB

Kimlərdir halal kəsbə məşğul olanlar?

**Cavab:**

Vladiqafqazda «Novruz» mədrəsəsinin şagirdi dərs vaxtı dərs oxuyur, oxumayan vaxt gedib küçədə oturub qabağına bir vaqs qutusu qoyur və yoldan keçənin çəkmələrini silir.

---

Dəxi kimdir halal kəsbə məşğul olan?

**Cavab:**

Halal kəsbə məşğul olanların biri də Ağcabədi kəndində Seyid həkimdir ki, atasından qalan kitabı qabağına qoyub kəndlilərə həkimlik eləyir, hökumət də görür ki, Ağcabədidə bir belə mötəbər həkim var, daha özgə bir həkim və feldşer lazım deyil. Odur ki, bu günlər Gəncə qubernatoru hökm eləyibdir ki, Ağcabədi kəndinin feldşeri köçüb getsin Hindarxında qalsın, çünki Seyid həkim ağcabədililərə kifayətdir.

---

## QAMBURSKİ BİFŞTEKS

Pul qazanmaq indi dünyada çox asan olub. Əgər bir adam istəsə, az müddətin içində bir çox pula sahib ola bilər. Bundan ötrü heç bir zəhmət lazım deyil, fəqət bir parıldayan eynək alıb gözlərinə taxasan və zəncirin də sol qulağının üstündən sallayasan baş aşağa. Dəxi bir dəst kostyum, bir varatnik, bir cüt visoki pobor çəkmə, əlində trost, bığları da ala Vilhelmi qalxız yuxarı. Vəssəlam, tapdın qazancın yolunu.

---

Bəs hər bir işdən ötrü sərmayə gərək olsun. Belə bir müftə qazanca nə yol ilə sərmayə tapmaq? Hə, indi ki, belə oldu, əzizim, ta niyə ürəyini sıxırsan, qulaq as mən sənə öyrədim.

---

Bu işdən ötrü heç bir sərmayə lazım deyil. Bir ərizədi, verirsən həftəlik və ya gündəlik bir qəzetəyə izn istərsən, elə ki, rüsxət verdilər, başlagilən qeyri qəzetələrdə elan eləməyə, «elmi, fənni, siyasi, iqtisadi, filan qəzetəyə abunə qəbul olunur, əcnəbi məmləkətlərinə filan qiymət, Rusiya şəhərlərinə filan qiymət. Adres: məsələn, Ordubadda, ya Orenburqda». Elə ki, kefin istəyən qədər abunə pulu yığdın, bir, ya iki ay qəzetə çıxart, daha bəsdir, özünü ver yavaşca restoranlara, «Qamburski bifşteks» yeməyə, qəzetə alanların canı çıxsın.

---

Əgər mənim bu sözlərimi zarafat hesab eləsən, qulaq as, sənə bir əhvalat nağıl eləyim. Bir neçə ay bundan əqdəm Orenburqda Dadaş Teymur Qrimov adında bir adam «.......» adına həftəlik bir qəzetəyə izn alır. Çoxlu abunə yığdıqdan sora üç, ya dörd nömrə çıxardır, sora hərif özünü verir «Dekadanski» restoranına, otbivnoy katlet yeməyə, daha nə qəzetə çıxardır, nə də xalqın abunə pullarını geri qaytarır.

---

Müdir cənabları abunə yığmamışdan qabaq insafən Orenburq tatarlarıyla söz vermişdi ki, hər həftə qəzetəsində bülbül kimi oxuyacaq, milləti də qabağa aparacaq. Sonra kefi istəmədi, oxumadı. Dəxi ürəyini niyə sıxırsan? Budur bizim işlərimiz, əzizim.

Manəndi-şəcər nabit olur sabit olanlar,
Hər qangı işin əhli isən, onda davam et!
Nöqsanını bil, bir işə ya başlama əvvəl,
Ya başladığın karı pəzirayi-xitam et!

*Xortdan bəy*

---

## ELAN

Qəflət etməyiniz

Bostanları bədnəzərdən və bəlayati-səmavi və ərzdən hifz etmək üçün mücərrəb dualar yazıram, həqqizəhmət iki manat pul və yainki qovun vaxtı bir yük qovundur. Xahiş edənlər bu adresə rücu etsinlər:

*Naxçıvan, Naberejnaya küçədə, nömrə 2024.*

---

## BİR DƏSTƏ GÜL

İranlı deyir ki, ədlilə dad olsun,
Osmanlı deyir ki, millət azad olsun.
Zahid nə deyir? Deyir ki, qarnım dolsun,
İranlı da, osmanlı da bərbad olsun!

Tacir arayır ki, bir ticarət yapsın,
Amil çalışır bu yolda xidmət yapsın,
İş mollalarındır ki, çalsın, çapsın,
Yatsın, dursun, qüsli-cənabət yapsın.

Jurnal, qəzetə çıxır ki, millət oxusun,
Hər bir əsərindən alsın ibrət, oxusun.
Rusca oxumuşlara bu iş ar gəlir,
Derlər: bunu qoy qara camaat oxusun.

Zənn etmə ki, zikrə, səcdəyə dalmaq üçün
Zahid yüyürür məscidə əcr almaq üçün.
Dün çaldığı səccadəyi satmış da, yemiş,
İndi yüyürür əlavəsin çalmaq üçün.

...........

**Come**

Seyyidol-əyyam xizab kərdən tənbir rəftən, həcamət qozəştən, bəd əz səhhəti-vücud müvəqqətən məşğuli-vəzarəti-daxile şodən.

**Pəncşənbe**

Nikəst bəd əz nəhar istirahət və isteda.

**Çaharşənbe**

Nikəst ğazet xandən və benoqtehae siyasi diqqət kərdən eslahe-omure-daxele.

**Seşənbe**

Nəşayəd, istefa dadən vaceb.

**Doşənbe**

Nikəst mehman rəftən və dər xedməte - xod istiğamət kərdən.

**Yekşənbe**

Nikəst istehmam və istefa.

**Şənbe**

Nikəst dər xane nişəstən və be omurate-xarice məşğul şodən.

Rotter

Əz təqvimi-Hacı Nəcmüddövlə. Tərcümeyi-hali-Sipehdari-əzəm.




Plov zəvvarı (Aşqabad). На поклонение священному «Плов»у.

## MƏDRƏSEYİ-NİZAMİ

Qoşunun sahibmənsəbləri gərək nizami elmlərini oxumuş olsunlar. Buna heç sözümüz yoxdur. Xorasan millətpərəstləri bu nöqtəni nəzərə alıb bir nizami mədrəsə tikmək fikrinə düşüblər.

– Bu da gözəl bir işdir, amma qəribə burasıdır ki, cənabi Etibarüssəltənə istəyir bizi inandıra ki, mədrəsənin bəqası və davamı Əhməd şahın vücudunun salamat olmağına bağlıdır. İdarəmizə göndərilən nizamnamədə belə yazılıb: lihəza dər zilli-təvəccöhati-bəla nəhayəti-həzrəti-höccət əcəllüllah fərəcə məhzi səlaməti-zati-mələkuti-səfat (şəkk yox) bəndəgani əlahəzrət qədri-qüdrəti-şəhriyariyi-şahənşah cəmcahi-imperatori-iraniyan pənah Sultan Əhməd şah Məmmədəli oğlu Qacar xələdullah mülkə və iqdamati-idareyi-cəlileyi-qoşun məmləkəti Xorasan və həmrahiyi-sahibmənsəbani- zül üğzülehtiram mədrəseyi-nizami iftimah yaft...

---

Hələ bu nizamnaməni də göndəriblər ki, jurnalımızda çap edək. Yazıq Molla Nəsrəddin.

*Lağlağı*

---

## MOLLA NƏSRƏDDİN İDARƏSİNƏ NUXADAN NƏSİHƏT

Molla əmi! Biz hərçi deyirik qəbul etmir, bəlkə sənin nəfəsində təsir artıq ola. Sən bir bu Ağaəli Əhmədov cənablarına nəsihət elə ki, yazıqdır. Bir para millət qayğısını çəkib onlara maarif yolu açmaq, məsələn, qız məktəbinə otaqlar vədə vermək, otaqlar əmələ gəlincə hər il məktəbin kirayəsini vermək, russki-tatarski məktəbə keçən il beş yüz manat göndərmək, o da teleqraf ilə. Bu cür işlərdən əl çəksin, cavandır, canını sıxmasın. Biz bu vaxta kimi elə bilirdik ki, tacir uşaqları yaxşı qumar oynar, çaxır içər, madamlar ilə gün keçirər ki, canı xarab olmasın. Tacir balası nədir, məktəb nədir? Hələ bundan bədtər odur ki, deyirlər bir su da alıbdır ki, camaata lazım olan yerdən axıtsın. Nə bilim deyirlər bir də fikri var ki, qız məktəbini tikdirəndən sora on beş kravatlıq bir mərizxana da açsın.

A balam, millətin nicat tapmağından sənə nə olacaq? Bircə öz tay-tuşuna bax, gör necə kef çəkirlər, sən də eləcə dolan. Bu işlərdən əl çək, sən də bizə yevropalı olmadın ki?! Vəssəlam!

*İmza: Nəsihətçi*

---

## DESİN

Hər kəsin hər nə sözü var, desin.

Dünən Zurnalı molla Məhərrəm əsnayi-moizədə buyurdular ki, imamların hər birinə məxsus ayrı Quran gəlib və dörd şəriətimiz var və zahirdə namaz qılmayan müsəlmanın qətli vacibdir.

Bu, Molla Məhərrəmin sözü.

Hər kəsin sözü var desin.

---

## ORDUBAD

Məktəblərdə imtahan qurtardı.

Təbrizli Molla Əbdüləlinin rəyasəti-təhtində olan məktəbdən 28 keçəl diplom aldı. Bu məktəbdən çıxanlar Təbrizin kasıbiyyə məktəbinə qəbul olunacaqdırlar. Bundan da əlavə divanxana və məhkəmələrdə müsəlmanca qol çəkməyə, imza qoymağa şəhadətnamə almışlardır. Məktəbdə oxuyan 120 uşağın nisfindən çoxu öz adlarını yaza bilirlər. Bu il sentyabrın əvvəlindən uşaqlar cümləsi müəllimin öz libasından geyməlidirlər. Buna cəhət indidən Təbrizə taqə-taqə şallar zakaz verilir. Bu günlər Təbrizli Hacı Əli əbaçının agenti buraya gəlmişdir.

Rəvayətlərə görə əbalar ora zavodlarına zakaz verilir.

## TEHRAN

Məhəmmədəli şahın məxsusi mallarından olan bəzi şeylər torqa qoyulub satılır. O cümlədən 12 dənə müəlləqi yahu və göyərçinlərdir ki, Sipehdari-əzəm alıbdır. Bu gün meydani-məşqdə ümumun gözünün qabağında yahulara məşq verirlərdi. Heyvanların çox zirək uçub 12 dəfə bir-birinin dalınca havada mayallaq vurmaları Sipəhdarı məmnun elədi. Buna cəhət tökülüb bu əziz heyvanların canına and verib bir də Sipehdarı istefa verməkdən vaz keçirdilər.

## TELEQRAFLAR

Naxçıvan–Xırman vaxtı olduğuna görə şəhərdə bir dənə də yabı tapılmır, çünki hamısını dərvişlər minib kəndlərə gediblər.

***

Mərənd – Buranın hamı boyaqçı fabrikaları kəmali-gərmi ilə tənzif boyamadadırlar. Bu tənzifləri Kükəmər seyidləri əmmamə qayırmaq üçün sifariş (zakaz) veriblər. Belə məlum olunur ki, ağalar Qafqaza səfər etmək xəyalındadırlar.

## TƏBRİZ XƏBƏRLƏRİ

Molla əmi, düz söz deyim sizə, bu günlərdə Əncümən əzası çox-çox ciddi iş başlayıblar, məxsusən dövlətin xalis mülklərin altı ay hər kəs icarəyə istədi, məhz dövlətə xidmət eləmək üçün, heç kəsə xatircəm olmayıb, axırda tamam xalisə mülklərini Əncümən əzası özləri icarə elədilər. Biçarələr nə eləyəydilər?! Hər kəsə versəydilər, yeyəcəkdi. Yazıqlar gör nə qədər zəhmət çəkirlər: xalisə icəradarlığı eləyirlər, biçarələr hökumət işlərinə kömək eləyirlər, biçarələr ədliyyə işlərinə kömək eləyirlər, biçarələr nəzmiyyə nizam atlı işlərinə, bələdiyyə işlərinə kömək eləyirlər, xariciyə race olan politik işlərinə kömək eləyirlər, biçarələr şəhərin pullarını cəm eləməyə, ya xərc eləməyə kömək eləyirlər, biçarələr şəhərin gözəl nemətlərin yeməyə zəhmət çəkirlər, biçarələr vaxtında pişnamazlıq, mərsiyəxanlıq, nökərçilik, badamçılıq, fişəngçilik, buğdaçılıq, ticarət, cürbəcür işlər görürlər. Daha, ay Molla əmi, yazıqlar nə eləsinlər, başlarına nə kül töksünlər? Bunların canı poladdan ki, deyil, dəmirdən deyil, daşdan deyil?! Daha on iki adam nə qədər iş görər, nə qədər çalışar və xidmət edər? Allah onların kölgəsini biz üzüqara millətin başından əskik eləməsin.

*Tambarançı*

---

## POÇTA QUTUSU

Aşqabadda «Millətpərəst»ə: «Firudiniyyə» məktəbinin uçiteli barəsində yazdığınız çap oluna bilməz, çünki abunənizin nömrəsini nişan verməyibsiniz, yad adamın da rəvayəti ilə müəllim barəsində elə töhmətli sözlər çap edə bilmənik.

---

Nuxada «Qızılqol»a: Qlavanı çox tərif edirsiniz. Sözünüzə inanırıq. Allah ağaya ömür versin.

---

Naxçıvan. Qarabağlarda «Çoxbilmiş»ə: Elanınız çap olunmayacaq.

---

Şuşada «Şair»ə: Çap olunmayacaq.

---

Morğulda «Genə o» cənablarına: Bu dəfəki qaldı.

---

Vladiqafqazda «Qələm»ə: Elə o qədər kifayətdir ki, yazdıq. Ürəyinizi sıxmayın və təzə xəbər olsa, yazınız.

---

Gəncədə «Miri»yə: Yazırsınız «sən mənim cəddim, məktubumu səbətə salma». Cəddinizin xatirəsi üçün kağızınızı səbətə salmadıq, amma çap eləməyəcəyik.

---

Ağdaşda «Əhməd»ə: Çox qurtdaladım, bir şey çıxarda bilmədim.

---

Vladiqafqazda «Münsif»ə: Qorxuram, kağızının çap olunmağını gözləmək sizə zəhmət ola, bağışlayınız.

---

Bakıda «Bir nəfər»ə: Yarısı 27-ci nömrədə çap olunar, amma çox yeri pozulmalıdır.

---

Aşqabadda Aslan bəy Nəsirbəyov barəsində şikayət yazana: Çap olunmaz, çünki abunənizin nömrəsini nişan vermirsiniz.

---

Bakıda «Heyvərə»yə: Allah atana rəhmət eləsin.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

## ELANLAR

15 rəcəb 1328 **Beşimci il** 11 июля 1910 г.

ملا نصر الدين

№27 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 27



Qızım, dәxi bәsdir, maşallah, yekәlibsәn, әrә getmәlisәn, oxumağın vaxtı keçdi.

## QANLI FACİƏ

Yox, əzizim, qanlı faciə bu deyil ki, Daşkənd civarında Gödək qəryəsi əhalisindən altmış yaşlı Canbəy Muradovun on dörd yaşında övrəti cavan nökəri ilə qoşulub qaçır və Muradovun bir nəfər qohumu başına on beş nəfər vəhşi türkmən yığır, gedir qızı və oğlanı tutur tikə-tikə doğrayır.

Xeyir, qanlı faciə bu deyil.

Yox, yox, mən ölüm, elə danışma, vallah, küsərəm, qanlı faciə bu deyil.

Qanlı faciə budur ki, yuxarıdakı əhvalatı nağıl eləyəndən sora idarə tərəfindən yazırsan ki, «bu uğurda tökülən qanların baisi 21 yaşındakı qızları yetmiş yaşındakı qoca kişilərə nikah edən mollanümalardır».

Budur qanlı faciə, mənim gözümün nuru!

---

Əgər bu sözləri yazanda huşun başında deyil idi, sözüm yox, yoxsa qana-qana yazmış olsan, di qulaq as.

Dünya yaranandan Şamaxıda şagirdlər müəllimi döyən günə kimi heç bir elə ittifaq düşməyib ki, bir mollanın yanına gəlib balaca bir qız uşağını altmış yaşında kişiyə nikah etmək istəyəndə, molla bir dəqiqə dayana. Və mənim bu sözlərimi elə indi, bu saatda hər bir molla oxusa, genə başa düşməyəcək ki, dəxi niyə gərək dayansın və niyə haman saat siğəni oxumasın?

Molla nə qanır qanlı faciə nə deməkdir? Daşkəndin faciəsinin adı tək bircə sənin yanında «qanlı faciə»dir, amma mollanın və mollanümanın nəzərində şəri hökmü əmələ gətirməkdir, çünki zəni və zəniyənin* qətli hər halda vacibdir.

---

Qoy «Həqiqət»in 151-ci nömrəsinin dördüncü səhifəsindəki «Qanlı faciə» əhvalatını üç yüz milyon müsəlman oxusun, tək bircə səndən savayı. Hər bir müsəlmanın borcu odur ki, tikə-tikə doğranmış on dörd yaşında qıza və oğlana sədhəzar lənət oxuyub desin: mərhəba türkmənlərə, maşallah mücahidlərə.

Budur qanlı faciə.

---

Sən istəyirsən ki, mollalarımız altmış yaşında kişiyə 14 yaşında qızları nikah eləməsinlər.

Çox əcəb, Allah atana rəhmət eləsin.

İndi gəl açaq axund Ərəszadənin



*Zəni-zina edən kişi, zəniyə-zina edən qadın. *(Red.–T.K.)*

«Təşrihül-fərayiz» kitabının 13-cü səhifəsini. Belə yazılıb: «Əgər doqquz yaşa yetişmiş bir qızı atası, ya ata babası ərə verə, əri ondan, o ərindən irs aparar».

Bə niyə dinmirsən? Bir de görüm, kim sənə deyib ki, 14 yaşında qızı altmış yaşında kişiyə vermək olmaz? Özgə şəhərləri bilmirəm, bizim küçədə Hacı Məlikin yetmiş dörd yaşı, övrəti Güllünün 12 yaşı var, bildir övrətin bir oğlu oldu, adını qoydular Həsən.

Budur qanlı faciə.

---

Məşədi Nurəli altmış yaşında bir kişidir, keçən il doqquz yaşında bir qız aldı.

Budur qanlı faciə.

Allahın göydə gəzən Ayı hər gecə neçə-neçə qanlı faciələrə şahid olur. Və əgər kişilərin otağına zor ilə çəkib apardığımız balaca qızların göz yaşlarını bir yerə yığsan, təzə bir ümman dəryası əmələ gələr.

Budur qanlı faciə.

---

Bunların hamısını görə-görə və bilə-bilə və eşidə-eşidə gündə göbələk kimi artıb törüyən yazıçılarımız yazırlar, yazırlar, yazırlar, hər yanda yazırlar, yerdən, göydən, hürriyyətdən, şəriətdən, politikadan, İrandan, Turandan, əlfaz, ibarə, şəxs, imza, şöhrət, ad, nəzm, qafiyə, genə əlfaz, genə ibarə. Amma övrətlərimizdən bircə söz də yox. Çünki ağaların xoşuna gəlməz, ağaların da xoşuna gəlməsə, mənə xeyir eləməz. Bağışla, bilmədim, qələt elədim.

Budur qanlı faciə.

*Molla Nəsrəddin*

---

## NƏZİRƏ

«Həqiqət»in 156-cı nömrəsində bir belə şey oxuduq:

### ƏDƏBİYYAT

Bir jon türkün* otağı**

Həyatın ən acı həsrətlə intizarında!
Müqabirin duyuruolmaz dərinliyiylə dərin.
Yürür... bitər əzəliyyət bunun cidarında
Qaranlığında yanar ibtidası atinin!..

Qırığ dökük ikiyəm: bir uzun təhəssürlə,
Baxar ziyasına şəmsin! Sükunəti-mütləq!
Gəhi sükunəti ixlal edən təəssürlə
Bu şerimin zərəban məalıdır ancaq.

Uzaqda bir qanapa... iştə sağ tərəf guşda
Yatar zülal siyahı bir əski tabutun.
Çürür bunun üzərində xəyali-məhzunəm.

Həvaris, Lusid lö novi... Qaç kitabi-fərsudə
Atılmış eyləcə duri-nigahi ovqatın
Bən iştə Müsse, Rasinlə burda mədfunəm!

*Əhməd Kamal*

Demək, Əhməd Kamal bu şerə bir nəzirə istəyir: bu şerin nəzirəsi çoxdan yazılıb. Yazılıb vilayəti-Şamaxıda. Belə yazılıbdır:

Səri-hilleyi-ərus, qəmi-azadi-mütrüban
Çakuci-misgəran mənalim avərəd,
Saqi, beyar badə bedeh bər kəfi-ləpir
Rütəb, ya büsati-nəhalim avərəd.

Əgər şairi-möhtərəm Əhməd Kamal desə ki, bu şerdən heç bir məna çıxmır, o vaxt biz cavab verərik ki, onun şerinə nəzirə yazmışıq, necə ki, özü belə «zakaz» veribdir.

*Lağlağı*

---

## BAKIDA BİR KƏNDDƏ MÜHAVİRƏ

Kəndçi: Denilir «elm oxuyun» sözləri hər anda bizə,
Bunu təsdiq ediyor ayeyi-Quran da bizə!
Axund: Hansı Qurandır o ki, onda yazılmış bu xəbər?!
Şiə mollası yazan türkücə Quransa əgər,
Mən onun yazdığı Qurana yavıq durmayıram,
Maşa ilə yapışıb əl də belə vurmayıram.
Kəndçi: Xub... Buyur, sünni yazan bir neçə təfsiri oxu!
Elmin icabı üçün ondakı təqdiri oxu!
Axund: Oh... apar bir yana at sünni yazan təfsiri,
Başına dəysin onun tərcüməsi, təhriri.
Bizlərə molla filankəs yazan asar gərək,
Biz olaq ondakı məzmuna xəbərdar gərək!
Kəndçi: O yazıb: yer öküzün buynuzu üstündə durur.
Biz gərəkdir inanaq ki, kişi böylə buyurur?!
Axund: Buna şübhən də var?
– Əlbəttə, inanmam bu sözə!
Lənətullah, a gavur! Şəkk ediyorsan öküzə?

*Məclisdə olan*

---

«Qamçı»: Bəxtəvər kimlər idi aləmdə? –
Deyə, məndən elədi molla sual.
Mollanın kəndini göstərməmdə
Etdi təsdiq, həmi qəti-məqal.

*Şallağ*

---

* 15 iyula qədər bu şerə bir nəzirə yazılıb idarəmizə göndərilməsi şairlərimizə təklif olunur.

**Jon türk (fr.) – gənc türk. *(Red. – T.K.)*

Xoklu Seyyid Haşim



Qramofon dükanının qabağında




Vay-vay, gəna-gəna, haram, günah




Müsafir: Bu ağac nədən ötrüdür?
Kəndli: Məhərrəmlikdə burada gecələr «şaxsey» gedəndə ağacın başına fanar qalxızırıq.
Müsafir (təəccüblə): Maşallah, maşallah?!



Bir qəzetənin bağlanmağının şadlıq xəbəri.

Naxçıvan məhkəməsində «nürgüd»lü Mir İsanın «tans» etməsi.

## ŞILLAQ

Yerin üstündə gəzən «axtafabil»,
Göyün altında uçan «dirjabil»,
Sudakı sonku novicad «gəmi»,
Quruda top, «pulemyot»ya «şarapil»
«Laf söylənməsə gər» buyruğuma,
Deyərəm, bağlıdılar quyruğuma.
Bircə yol quyruğumu tərpədərəm,
Bütün aləmləri viran edərəm».

*Gavi-mahi*

---

## CULFA

İran hökuməti bu günlərdə Rusiya hökumətinin Kitay və Balkan işlərindən ötrü məşğul olmasından istifadə edərək böyük imtiyazlar tələb etmişdi. O cümlədən, tələb edir ki, cümə günləri olanda Culfa sərhəddində olan rus, erməni və gürcü mehmanxanaları İran tərəfinə keçsinlər, orada alış-veriş eləsinlər. Çünki hər cümə günü hökumət məmurlarının rus tərəfinə keçməsi ağır qiymətə oturur. Ona cəhət mehmanxanalar və oralarda olan əziz müsafirlərin cümə günləri İran tərəfinə keçmələri tələb olunmuşdur.

---

Culfa – Burada mehmanxanaçılar qərar qoydular ki, cümə günləri mehmanxanalarda kef çəkmək üçün keçən əyanların və sahibmənsəblərin cibində yüz manatdan əskik olsa, mehmanxanaya buraxmasınlar.

Libas və uniforma qəbul olunmayacaqdır. Çünki Rusiyada olan Qaradağ fəhlələri o tövr libasların qiymətini birə üç qat azaltmışlar.

*Məmməd Səid Ordubadi*

---

## İMTAHAN

Cənab Molla əmi! Özgə şəhərlər və özgə məktəblər kimi bu il Aşqabadda bizim babi məktəbində də imtahan verildi. Özgə millət məktəblərinə ibrət olmaqdan ötrü bu məktəbin şagirdlərinin atmetkaların yazıram, bu qərar ilə oldu:

| | |
|---|---|
| Əlvahi-ərəbi | 5 |
| Əlvahi-farsi | 5 |
| Münacati-ərəbi | 5 |
| Münacati-fars | 5 |
| Lisani-rusi | yarım |
| Lisani-türki | yarım |
| Arifmetika | yarım |
| Coğrafiya | yarım |

*Qəlyan*

---

## ELAN

Hər cür xəlvət və aşkar nikah və siğələr kəsirəm. Şərti budur ki, qızı gərək özüm görəm və yaşına baxam. Doqquz yaşından yuxarı olsa, nikah və siğə kəsə bilmərəm. Qiyməti isə ucuzdur, baha deyildir, iyirmi beş manata kimi xərci vardır.

Və hər cür zəkat, fitrə də alıram, hərgah verməyənlər olsa da yazıb siyahı üzrə verirəm kəndin yüzbaşısına, döyə-döyə, gücnən tövləyə saldırıb alıram. Bu kimi işlərdə çox yədim var.

Xahiş edənlər bu adresə rücu etməlidirlər:

Göyçay uyezdinin Qarabaqqal kəndinin mollası Musa əfəndi

## ERMƏNİ-MÜSƏLMAN DAVASI

Bizim içimizdə ata-babadan qalma ən gözəl, ən istəməli adətin birisi də qız götürüb qaçmaqdır. Çox vaxtlar qız götürüb qaçanda hər iki tərəfin cavanları əl tüfəngə dəyib atışmanı başlayırlar. Çox düşür ki, aralıqda on, on beş nəfər də adam ölür. Qızın atası, qardaşı və sair qohumlarından da yaralanıb və ölən olur. Çünki el və qəbilə arasında bir milli qeyrət vardır ki, qız üstündə öz başlarından da keçərlər. Lakin erməni tayfası müsəlmanların bu milli adətinə həmişə həsəd aparırlar və bir neçə yerlərdə də oğurlamaq istəmişdilər. Məsələn, o cümlədən, Zəngəzurun Vəhrivar kəndində bir erməni uşağı bir erməni qızını götürüb qaçdıqdan sora gəlib əlindən almışdılar, bu iş müsəlmanların çox acığına gəlmişdi. Lehvaz kəndinin dövlətlisi Kərbəlayı Mehdi kəndin mollası Mirzə Ələkbər ilə bərabər bu işi protest eləmişdi. Çünki Kərbəlayi Mehdinin öz oğlu, hətta Axund Mirzə Ələkbərin özü də o tərəfin qız götürüb qaçanlarındandır. Bəli, mətləbdən çox uzaq düşdük. Erməni tayfası müsəlmanların bu milli adətlərini həmişə oğurlamaq istəyirdilər. Amma yerinə də yetirə bilməyib genə əldən buraxırdılar. Bunun da cəhəti öz ruhaniləridir. Çünki bir erməni qız götürüb qaçanda bu nainsaf keşişlər asan vəch ilə kəbin də kəsmirdilər. Amma Bəsttoy mahalının mollası Molla Muxtar və Zəngəzur mollası Hacı Mirbabanın yanına gecə yarısı bir qız aparanda yavaşca pulunu alıb əlüstü kəbinini kəsir. Hərçənd sora o övrətin sahibi də çıxır, amma eybi yoxdur. Hər şey əvvəlinə yetişir. Genə övrət əvvəlki ərinindir, ancaq gecənin yarısı adamı məəttəl qoymaq da kişilikdən deyil. Bəli, bu erməni milləti həmişə bizim yaxşı işlərimizi öyrənmək istəyirlər. Məsələn, iki gün bundan qabaq bir erməni öz nişanlısını götürüb qaçmaq istədikdə, atası və qohum-qardaşı tökülüb o ki, qərardır, döyüb, qızı da əlindən alıblar. Bu açıq oğurluğu görən müsəlmanlar həyəcana gəlib şəhərdə böyük qiylü qal düşməkdədir. Çox qorxu vardır ki, təzədən erməni-müsəlman vuruşması da düşsün.

*Hərdəmxəyal*

---

## NAXÇIVAN

Bulkan və Qərəçuğ qabağından 25 xalvar həna Naxçıvan şəhərinə qandrabat gətirən qaçaqçılar ilə saldatlar arasında atışma olub, bir neçə saatdan sora hənaları salamat qurtarmışlar. Bu xəbər şəhərə yetişdikdə qırmızısaqqallar bir yerə yığılıb böyük şadyanalıq etmişlərdir. Rəvayətlərə görə mollalar çox nəzir eləmişlər. Allah cəmi möminlərin nəzirini qəbul eləsin.

***

---

**Ağdaş, 5 iyul.**

## «MOLLA NƏSRƏDDİN» İDARƏSİNƏ XƏBƏRDARLIQ

Molla əmi! 25-ci nömrənizdə Qəlyanboğaz tərəfindən yazılan məktuba qarşı Qara Əhməd ilə Hacı Həsən əmi bərk protest etdilər və sizə acıqları tutub sizi və qravat alanı döyməyə hazırlaşıblar.

Bu xəbəri sizə yazıram ki, daha onlardan yazmayasan, hərgah yazmış olasan, Hacı Həsən əmi and içir ki, çörəkçilərə satdığı beş pudluq acı unun üstündən bundan sora yarım pud götürməyib, lap bir pud götürəcək hər qabdan.

Molla əmi! Deyərsən bu xəbəri sizə indi niyə yazıram? Ondan ötrü ki, Hacı Həsən əmi burada yox idi, Gəncəyə getmişdi, çünki keçən il acı un satmaqdan ötrü divan tərəfindən on beş gün dustaq kəsilmişdi, özün bu işdən qurtarmaqdan ötrü getmişdi vəkil tutmağa. İndi üç gündür ki, gəlib Ağdaşa və əhvalatdan xəbərdar olub çox bərk acıqlanıbdır. Amma Molla əmi! Türklərdə bir məsəl var, deyərlər ki: «sirkə çox tünd olsa öz küpəsini çatdadar». Vəssəlam.

*Sizə müxlis xəbərçi*

---

## TƏBRİZ XƏBƏRLƏRİ

Əlhəmdülillah, sərdari-Salar şəhərdən çıxandan sora, yəni İclalülmülk əsbabi-kuk eləyib oları çıxardandan sora özü rəisi-mücahid olub, olar deyən yamanları deyir. Amma olara verilən pula qane deyil, əvvəl-axır yüzcə min tümən pul istəyir, iyirmi min tümən xalisə pulundan yanında var, kəsrini də yaman yuğuznan istəyir. Haqqı da var, biçarə rus konsulxanasında çox pullar xərc eləyib və indi də şuluq eləyənlərə çox pul verir.

Bu gün konsullardan birisi İclalülmülkün evində məclisi-müzakirədə fərraşbaşılığı qəbul elədi. Yaşasın mücahid.

***

İclalülmülk və Əli Müsyö partisindən Əsgər Miskin adlı «Mühakimat» ruznaməsinin müdirini bazarda çox döyüb ki «oğruların abrusun neyçün aparırsan?» Ruznamə də təvəqqüf olundu.

İclalülmülk öz şəxsi mənfəətini Müxbirüssəltənənin getməyində görür. Bu günlərdə çox ciddi çalışır ki, Müxbirüssəltənə Azərbaycandan getsin.

*Tambrançı*

---

## XANƏNDƏ

Səlyanda «Gülüstan» mehmanxanası üçün bir xanəndə lazımdır ki, gecələr saat on ikidən sübhə tək «Şüştər»dən, «Mahur»dan, «Ay bəri bax»dan-filandan oxuyub müsafirlərin ləzzət və istirahətli yatmaqlarına səbəb olsun, çünki mehmanxana sahibinin özünün səsi batıb, müsafirlərdən xəcalət çəkir.

*Adres: Səlyan, mehmanxaneyi – «Gülüstan».*

---

## AÇACAQLAR

Məşhəddə Qafqaz müsəlmanları dörd ildir ki, bir məktəb bina etmək istəyirlər. Yəni sən deyirsən ki, yalandır? Yəni necə yalandır ki, dörd ilin ərzində neçə dəfələr ilə cəm olub məsləhət ediblər, danışıblar, görüşüblər və axırda dağılıb gedirlər evlərinə. Mən bilmirəm ki, bir para qəlbiqara adamlar niyə Allahdan qorxmurlar və niyə xalqın barəsində bədgüman olurlar?! Dörd ildir ki, kişilər hey çalışmaqdadırlar ki, Məşhədi-müqəddəsdə bir müqəddəs məktəb açsınlar, amma yazıqlar nə eləsinlər, məgər bu tezlikdə məktəb açmaq olar?! Məgər bir fikirləşmək lazım deyil? Məgər bir qabaqca götür-qoy eləmək lazım deyil? Axır bir de görüm dörd il nədir? Məktəb də ki, zarafat deyil: Məgər dörd ildə məktəb açmaq olar? Hər şeyin qaydası var. Niyə yazıq qafqazlıları məzəmmət eləyirsən? Axır insaf da yaxşı şeydir. Axır bir insaf elə.

*Cırcırama*

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

Bratya Mextiyevi

– Ay qardaş, Məşədi Mehdiqulu əminin mantyoru haradadır?
– Budur, əzizim.

Hüzuri-qəlb



Cavan babilərə töhfə.

22 rəcəb 1328 **Beşimci il** 18 июля 1910 г.

# ملا نصرالدین

№28 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 28




Konsul və general qubernator.

General: – Neçə yaşın var?

Konsul: – Qədim Nizamülmülk Təbrizdə hakim olanda mən bu boydaydım.

Litoq S.Bıxova

## ƏDƏBİYYAT

Ey özü abad, əhli əhli-iman Naxçıvan!
Mədəni-elmü təməddün, kani-ürfan Naxçıvan!
Afərin olsun sənin insaflı, dindar əhlinə,
Səndə yoxdur bir nəfər mərdud, şeytan, Naxçıvan!
Məktəbin, darülfünunun bol, özün darülədəb,
Sakini əhli-maarif, əhli-vicdan, Naxçıvan!
Alverin raic, qazancın çox, əkinçin bişümar,
Taxılın bol, hasilin təhsinə şayan, Naxçıvan!
Var yeri aləmlərə fəxrü mübahat eyləsən,
Səndə var Çakər kimi şair, süxəndan, Naxçıvan!
Rövzəxanın, vaizin hər ölkədə məşhurdur,
Sadəlövhü biqərəz, guya ki, heyvan, Naxçıvan!
Səndə yoxdur bir nəfər məşrutəyə bədxah olan,
Açmısan əhrar ilə ibrarə meydan, Naxçıvan!
Sakinin, əhlin bütün jurnal, qəzet məftunudur,
Nəşri-elmə, nəşri-fənnə bəzl edər can, Naxçıvan!
Bir «pragimnaziya», ya bir «realni» açmağa
On beş ildi səy edirlər səndə hər an, Naxçıvan!
Səndə yox büğzü ədavət, büxlü qeybətdən əsər,
Pək gözəl rəftar edir əsnaf, bəy, xan, Naxçıvan!
Mərhabalar şeyxinə, əhsən o zati-pakə kim,
Dinin etməz cifeyi-dünyayə qurban, Naxçıvan!
Bir təbibi-haziqin var binəzirü bibədəl,
Mürdəyə versə dəva gər, bəxş edər can, Naxçıvan!
Ömrü olduqca Cüvəllağı yazar tərifini
Əlqərəz, hər vəzinə olmuş sənaxan, Naxçıvan!

## KÜFTƏ

Mən bir vaxt çox sevindim. Eşitdim ki, müsəlmanlardan bir firqə çıxıb, köhnə adətləri, köhnə qaydaları protest edirlər və deyirlər ki, dəxi köhnə güzaran bu zəmanədə yaramaz. Təzə qanunlar yazıblar, zəmanəyə müvafiq şəriət təsis ediblər. Mən çox şad oldum, elə bildim dəxi bundan sora millət tərəqqi edəcək. Yevropa qaydasıyla məktəblər açılacaq, təlim-tərbiyə olacaq, hüquqi-nisvan qaytarılacaq. Təlim ümumi və cəbri olacaq. Yəni bir məktəbdən şəhadətnaməsi olmayan oğlana heç kəs qız verməyəcək və bir məktəbdən şəhadətnaməsi olmayan qızı heç oğlan ala bilməyəcək. Oğlanla qız bir ixtiyarda olacaq, hətta irs də bərabər olacaq. Özləri də çox məşrutəçi, bəlkə də cümhuriyyətçi olacaqlar. Mən çox sevindim, dedim: mərhəba, babi qardaşlar, bax siz doğru deyirsiniz, elə zəmanə də bunu istəyir. Bir gün getdim oldum xalis babi.

Bir az sonra baxdım gördüm ki, xeyr, elə bunlar da cənnət axtarırlarmış. Gördüm elə haman küftədir, ancaq adını dolma qoyublar, yəni onda da Allahnan ərəbcə danışırsan, bunda da. İntəhası, onda «qülhüvəllah» deyirsən, bunda «əşhədu bi-vəhdaniyyətəku». Onda da gərək gündə bir neçə dəfə öz sözünü Allaha ərəbcə deyəsən, bunda da. Onda gərək orucu ramazanda tutasan, bunda bir özgə vaxtda. Onda yüz minlər xərcləyib, ibadətxana tikib adın







«məscid» qoyurlar, bu da yarı milyonlar xərcləyib ibadətxana tikib adın «məşruqüləzkar» qoyurlar. Onda da pirlər, ziyarətgahlar, bunda da daxi artıq. Bircə qalıb tuğ gəzdirməklə çavuş. İnşallah, o da tez sərəncam olacaq. Onda övrətlər çarşaba bürünürlərdi, indi bunda iki çarşava bürünüb dörd də rubənd bağlayırlar. Onda şeyxfəzlüllahlar, mirhaşımlar laməhalə pulcığaz alıb istibdada kömək edirlərdi, bunlar müftəcə gecə və gündüz şahi-adil Məhəmmədəli şaha dua edirlər. Qərəz, nə başağrısı, haman küftədir dolma adıyla gəlib. Əbəs yerə müsəlman qardaşlar onlara «kafir» deyirlər. Bax, kafir yevropalılar kimi, yaponlar kimi, amerikalılar kimi olar. Bunlar kafirfilan deyil. Bunlar dəxi mömin, dəxi müqəddəs, dəxi mütəddəyyin bir tayfadır. Onlar ki, belə başlayıb, söz yox, behiştə də sahib olacaqlar.

*Babi*

---

## TAPMACA

Kimdir o, arifi görcək pozulur,
Deyəsən başına odlar saçılır,
Görgəcin cahili rəngi açılır,
Sanki saqqalına gövhər düzülür?

---

## VƏBA NAXOŞLUĞU

Mən həmişə demişəm və genə deyirəm ki, çox naxoşluğun əlacın müsəlmanlar yevropalılardan yaxşı bilirlər. O cümlədən, elə biri də bu vəba naxoşluğudur. Bu günlər müsəlmanlar Tiflisdə dəstə bağlayıb mərsiyəxan, sinəzən, zəncirvuran və dua oxuyan götürüb və yeddi dənə də qurban qoyunu alıb, vəba naxoşluğunun qabağın kəsməkdən ötrü getdilər qəbristana və orada yaxşı mərsiyə deyib və dua oxuyub, qurbanları kəsəndən sora başlarına və sinələrinə vura-vura gəldilər bazara və oradan getdilər məscidə, orada da sinə vurub və mərsiyə deyib doyunca ağlayandan sora dağıldılar. Haman o gündən vəba naxoşluğu Tiflisdən yox olmağa üz qoydu. Əlbəttə, özgə şəhərlərin də müsəlmanları bu müalicəni dəsturüləməl edib bu qayda ilə vəbanı rəf eləsinlər.

*Doktor Məşhədi Fərzəli*

---

## BİR GÜL

Vaiz ki, çıxar mənbərə hey püflər odu,
Təkfirə qoyar kimin ki, eşq isə modu.
Vardır deyəsən bu xazini-niyranın
Ağzında ekstrenni kafir zavodu.

*Bağban*

---

## NƏZM

Çıxma səhraya, tikanlar vardır,
Gəzmə çün sayə, ilanlar vardır.

---

Bu neyistanə gəlib girməməli,
Bu təmaşayə baxıb görməməli,
Hələ ömr eyləməli, ölməməli,
Çünki bir özgə zamanlar vardır,
Gəzmə çün sayə, ilanlar vardır.

---

Demə bu ölkə müsəlmanlıqdır,
«Həbəş ormanlığı heyvanlıqdır»,
Mülkədarlıq, ağalıq, xanlıqdır,
İti xəncər pəhlivanlar vardır
Gəlmə bu yanə, ilanlar vardır.

---

Gürcülər içrə qalıb rahət elə,
Gözəl insanlar ilə ülfət elə,
Nə gəlib gör bizi, nə lənət elə,
Nə də gör yaşlı cavanlar vardır,
Gəzmə çün sayə, ilanlar vardır.

---

Nə işin var, baba, Bakudə sənin,
Qələdə, Gəncədə, hər suydə sənin,
Meşədə, qəryədə, həm köydə sənin,
Tökülən su kimi qanlar vardır,
Gəzmə çün sayə, ilanlar vardır.

---

Ya deyirsənmi rəcəbdir, şəban,
Gəlir ardınca bunun da ramazan?!
Olacaqsan gedibən mərsiyəxan
Sənə yer yox, neçə canlar vardır,
İki min mərsiyəxanlar vardır.

---

Əcəba, səndə o təqrir hanı?
Hər sözü tərsinə təfsir hanı?
Aləti-hərbeyi-təkfir hanı?
Nə qədər yaxşı yamanlar vardır,
Neçə imanı satanlar vardır.

---

Varisi-məsnədi-peyğəmbərimiz,
Ziynəti-məscidimiz minbərimiz,
Ağamız, sahibi-taci-sərimiz
Hacı mir molla, filanlar vardır,
Yaşıl əmmamə qoyanlar vardır,
Nizəvü tirü kamanlar vardır,
Gəzmə çün sayə, ilanlar vardır.

*Kefsiz*

---

## YA DÜNYA, YA AXİRƏT

Bakı şairi mərhum Qumri öz mərsiyə kitabında deyib: «Əhli-dünyanın olmaz axirəti. Gər bunu istər isən ondan keç. «Nə gözəl şer, nə haqq söz. Bu şer hamı şer-




Ağa Mircəfər: Sən deyirsən bura mənimdir.
Rəhim Sərraf: Xeyr, ağa, buranı əyalət tövqif eləyib ki, sahibi naçar qalıb əl çəksin.

Azərbaycandan bir nümunə.




Qafqazda elm və maarifin mərkəzi hesab olunan Şuşa şəhərində.
Mollalar «Molla Nəsrəddin»i qadağan ediblər.

lərin padşahıdır. Bu şer «Həqiqət» qəzetəsinin «həfteyi-ədəbi»sində yazılmağa layiq bir şahbeytdir. Bu şerə tərcümə filan da lazım deyil. Bu şer, özü doğruca deyir ki, hər millətə ki, axirət lazımdır, onun dünyası ola bilməz. Yəni ya dünya, ya axirət.

Məsələn, aşkar işdir ki, firənglərə, ingilislərə, germanlara behişt, huri, qılman qismət ola bilməz. Və onlar özləri də heç o xəyalda deyillər, o məlunlar elə özləri öz ixtiyarları ilə aləmi-zərrdə dünyanı qəbul ediblər.

Amma biz yox, bizə dünya lazım deyil, bizə axirət lazımdır. O adamlar ki, bizi tərəqqiyə, mədəniyyətə, yəni dünya tərəfə çəkir, onlar müsəlman deyillər. Əgər müsəlman olsalar, bilərlər ki, müsəlmana behişt lazımdır, hovuzi-kövsər lazımdır. Huri-qılman lazımdır ki, onlara heç insü can əli dəyməyib. Nədir beş günlük dünya? «Əddünya cifeyi, talibh kəlab»*.

Qoy ona yevropalılar sahib olsun, ağa olsun, hakim olsun. Müxtəsər, dünya ilə axirət bir-birinin ziddidir, onu istəyən gərək bundan keçə, bunu istəyən gərək ondan keçə.

Nəcəfül-əşrəf müctəhidlərinin fitvası ilə İran məclisindən iranlılar Tağızadəni qovdular. Çox yaxşı elədilər. Canım, kişilərə axirət lazımdır, dünya lazım deyil da!!! Tağızadə ömründə heç bir gün axirət fikrində olubmu? Həmişə dünya fikrində, millət qeydində, tərəqqi xəyalında... Bizə o və onunla həmxəyal adamlar qətiyyən lazım deyil. Bizə elə adamlar lazımdır ki, cənnətin yolun, behiştin qapısın bizə nişan versin. Bizə müctəhid lazımdır. Əlbəttə, gərək tağızadələr qovulsun, çünki onlar dünya əhlidir. Qoy əcnəbilər gəlsin vətənimizə sahib olsunlar. Bura bizim vətənimiz deyil, bizim vətənimiz axirətdir ki, ora da əcnəbilərin yolu yoxdur.

*Qızdırmalı*

---

## NAXÇIVAN

Keçən gecə şəhər bulvarında bir nəfər kəbleyi gəzdiyi yerdə qısapaltar gimnaziya şagirdlərini qol-qola gəzdikdə görüb, birdən-birə özünü saxlaşdıra bilməyib yıxılıb özündən getdi. Dərhal biçarə mərizxanaya götürülüb müdavati-tibbiyyə edildisə də, kargər təsir olmayaraq vəfat etmişdir. Allah bu biçarəyə rəhmət edib, qalanlarına səbr versin.

***

Naxçıvan – İki gün bundan irəli bir nəfər nal-mıx satan məşədi on manatdan ötrü məscidi-cameə and içdikdə iki əlləri ilə məscidin divarına elə bərk çırpdı ki, var-yox bir məscidimiz var idi, o da uçub töküldü.

---

## ƏDALƏT VƏ MALİYYAT

Hər kəs nə deyir-desin, mən genə deyirəm ki, dünyada bu qəzet və jurnal çıxardanlara hər nə eləsən, azdır. A kişi, o qədər kötək yeyirlər, ölürlər, dalaşırlar, təkfir olunurlar, genə dik dediklərini deyib, bu biçarə, mömin dindar müsəlmanların yaxalarından əl çəkmirlər.

Doğrudan ki, deyiblər: «Günah öldürəndə deyil, öləndədi». «Mühakimat» qəzetinin müdiri Mahmud Qənizadə-Səlmasi Təbrizdə haqqında cəzasına çatıb və yaxşı eləyiblər ki, günün günorta çağı bazarda vurub şilik-milikin dağıdıblar. Canım, iki yüz min Təbriz camaatı özlərinə ədliyyə əzası seçirlər. «Mühakimat»ın müdiri nəçi karədi ki, onlara irad eləyib və millət inanılmışlarını rüsvayi-aləm eləsin?! Ədliyyədi, keflər istər orada ədalət elərlər, kefləri istər zülm elərlər, kefləri istər müqəssirləri zindana məhkum elərlər, kefləri istər hərdən bir müqəssirlərin xoşgil cavanlarından seçib evlərinə apararlar.

Xoşgil müqəssirlərin birini ki, Hacı Mirzə ağa Büllurçu evinə aparıb və ona rəhm eləyib qoymayıb zindana gedib ürəyi sıxılsın, ona mehmannəvazlıqdan və məhəbbətdən başqa bir şey etməyib ki! Və işdə də ziddi-məşrutə və ya xilafi-ədalət ondan bir şey baş verməyib ki?!

«Mühakimat» çığır-bağır salıb biçarə kişinin təmiz adını ləkələndirir. Elə elər, onun da əvəzində əksər miskin camaatı yığıb onu ölümünə döyər ki, daha bir də qələt eləsin əlinə qələm alıb xalqa böhtan desin. Çox yaxşı, bir millət ki, ikicə il məşrutə alıb, məclisi-milli açmaq ilə duza, bişmiş kərpicə, əhəngə, kəcə maliyyat qoya (vəhalonki, indiyədək heç bir dövlət qoya bilməyib), o millətin üzvləri qanmır, elə bircə «Mühakimat» qanır?!

Vallah, əstəğfürullah eləyirəm, onlara qanmayan deyənin ağzında dili quruyar.

*O taylı*

---

## MİR ƏBDÜLHÜSEYN AĞANIN MİNBƏRDƏ NİTQİ

Camaat! Mən indiyə kimi heç kəsdən qorxmamışam və qorxmayacağam! Və hər bir sözümü açıq demişəm və deyəcəyəm! İstər məni Molla Nəsrəddin yazmasın ki, lap Molla Nəsrəddinin babası yazsın. Bəli, həzrət buyurubdur ki, gələr bir zaman ki, bidət bidət üstə minər və hər kəsə vacibdir ki, haman bidəti həll edib, camaatı başa salıb, düz yola hidayət eləsin. Mən də sizlərə ərz edirəm ki, yol o yol idi ki, ata-babalarımız gedibdir və bizlər də gərək təzə çıxan müsəlmanlara baxmayıb və onların sözlərinə qulaq asmayıb öz yolumuz ilə gedək.

Şiələr! İndi zəmanə uşaqları elə xarab olublar ki, (bunlar hamısı elmin gücündəndir) nə ağsaqqala hörmət edirlər, nə çalsaqqala, nə mollaya, nə seyidə, nə baqqala. A kişi, indi bu saat yol ilə gəlirdim. İki nəfər dar diağonal şalvar geymiş gimnaziya şagirdləri bir-birilə söhbət edə-edə gedirdilər. Biri dedi ki: «Molla bu gün məni artıq narahat etdi». O birisi soruşdu ki: «hankı molla?» Cavab verdi ki: «Molla Mığ-mığ». Xülasə, bir salavat çevirin. Mən sizə yəqin deyirəm ki, beş il keçməz ki, elə diağonal şalvarlılar bu tövr məclislərdə oturammazlar, şalvarları partlar. Amin, ya rəbbilaləmin! Təkyə sovuşdu.

*İmza: Diaqonal şalvarlı*

---

*Dünya bir leşdir, onu istəməyənlər – it. *(Red. – T.K.)*

## İDARƏYƏ MƏKTUB

«Molla Nəsrəddin» məcmuəsinin möhtərəm müdirinin hüzuri-alilərinə ərz olsun ki, ramazan ayı yavıqlaşdığına cəhət ümum camaata xəbər verəsiniz ki, hər kəsə üsul ilə mərsiyəxanlıq eləyən və mərsiyə satan lazım olsa, mənə rücu etsinlər. Necə ki, özüm altmış sinnindəyəm, 49 il rəiyyətlərə zülm eləyə-eləyə mülkədarlıq və bu il mərsiyəpəzlik edirəm.

*Adresim: Şahtaxtında bir ağa.*

## AĞDAŞDAN

Bir neçə ay bundan irəli Ağdaşın təzə yetişmələri yığılıb bizə dedilər ki: «Gərək Ağdaş camaatı ərizə verib Gəncə nəşri-maarif cəmiyyətinin şöbəsini burada açaq. Bu iş bizdən ötrü çox mənfəətli bir işdir, həmişə bizim işimiz qabağa gedər». Biz camaat hamımız bir səs ilə razı olduq. Xəyal elədik ki, yəqin bu cəmiyyətimizdə yaxşı yemək-içmək söhbəti olacaq. Buna görə fikir elədik ki, bu böyük işdir, yeməksiz olmaz, razı olub kağıza qol yazdıq. İndi bir neçə gündür ki, deyirlər izn gəlib, nə bilim məclisə sədr lazımdır, xəzinədar, katib lazımdır, təftiş komissiyası belə gəldi, nə bilim protokol belə getdi, nə bilim nə, nə. Qərəz, işlərimiz olub qarışıq. Çünki, Molla əmi, özün insaf elə, de görək hansı bir məclisimizdə sədr olub, xəzinədar olub, katib, protokol-mratokol olub? Hələ bu nə axmaq işlərdi?

*İmza: Bir nəfər camaat tərəfindən vəkil*

---

## CAVAB

Cənab Molla Nəsrəddin! Əlbəttə, bu keçən həftələrdə qəzetələrdə Daşkənddə olan bir qəribə əhvalatı hamı oxuyub.

O əhvalat budur ki, on dörd sinnində bir cavanə övrət ki, əri altmış yaşında imiş, qoşulub öz nökərləri ilə qaçıb. Əri və ərinin qövm-əqrəbaları tökülüb hər nə cür isə övrəti və oğlanı tutub pis halətdə öldürüblər. Mənim bunlarla işim yoxdur. Mənim işim ancaq «Həqiqət» qəzetəsinin yazdığıyladır ki, idarə öz tərəfindən yazır ki, «biz bu işdə heç kəsi müqəssir görmürük, on dörd yaşında qızın kəbinin altmış yaşında kişiyə kəsən mollanı müqəssir görürük».

Cənab Molla Nəsrəddin! Bu axır vaxtlarda dünyada nə pis iş olsa biz biçarə mollalara isnad verirlər vəhalonki, heç çoxunda biz müqəssir deyilik. Məsələn, elə biri bu iş: sən özün ki, indi yetmiş yaşında kişisən, on dörd yaşında bir qızla və ya vəkilləri ilə gələsən mənim yanıma ki, kəbin kəs! Mən sizi nə haqla rədd etmiş oluram? Siz hankı xilafi-şər iş görürsünüz ki, mən sizi rədd edəm. Mən deyə bilərəmmi ki, gərək qızın yaşı filan, kişinin də yaşı filan olsun?! Onda mənə deməzlərmi ki, filan-filan şüdə, təzə şəriət çıxarmısan?

*İmza: Daşkənd uyezdinin Bittili kəndinin qazisi*
*Molla Nuru*

---

## POÇTA QUTUSU

Aşqabadda «Qərib»ə: yazırsınız ki, «Firudiniyyə» məktəbi müəllimi filankəs məktəbə bir cür xəyanət göstərib qaçıbdır. Bunu deyə bilərik ki, vəkilimizdən, ya tanıdığımız mötəbər əşxasdan bu barədə bizə məlumat gəlməsə, bir söz yaza bilmərik.

---

Morğulda «Genə o» cənablarına: «Həfteyi-ədəbi» məqaləsi bir az qaranlıqdır.

---

Göyçayda «Fatış xala»ya: Biz haradan bilək ki, Molla Əmir barəsində yazdıqların doğrudur?

---

Şamaxıda «Təzə məktəb» barəsində yazana: Biz özümüz oxuduq, xəbərdar olduq. Dəxi kifayətdir.

---

Nuxada «Çayqıraqlı»ya: Ürəfamız barəsində yazdığınız məktubu çap eləmək üçün sizi gərək yaxşı tanıyaq.

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***




**«Ruskaya iznamiya» yoldaşları**

«Bir vaxt olar ki, Rusiya məmləkətində əlahiddə bir islam hökuməti əmələ gələr».

29 rəcəb 1328 **Beşimci il** 25 июля 1910 г.

# ملانصرالدین

№29 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 к. № 29




Litoq S.Bıxova Əbru kəmane-Rostəm, gisu kəmənde-Zal Mojqan xədəngi-Giv, zənəx çaki-Bijənəst.*

*Tərcüməsi: Qaşı – Rüstəmin kamanı, saçı Zalın kəməndi, Kipriyi Givin oxu, zənəxdanı Bijənin quyusudur. (Red. – T.K.)

## ƏDƏBİYYAT

Hər sözü söyləmişik, hər işi səhmanlamışıq,
Salmışıq qaidəyə, düzləmişik, yanlamışıq,
Gecəni, gündüzü əlləşmədə, buzğunlamışıq,
Ölən öldü, qalanın dərdini dərmanlamışıq,
Dəxi bəsdir, dəxi bəsdir, dəxi yorğunlamışıq.

Budur, indi neçə ildir elə gündə çalışıb,
Bulaşıb zəhmətə, nari-qəmü dərdə alışıb,
İşləyib, can çürüdüb, yaxşı-yamana qarışıb,
Yetirib milləti sərmənzilə samanlamışıq,
Dəxi bəsdir, dəxi bəsdir, dəxi yorğunlamışıq.

Qayeyi-fikrimiz əhyayi-dili-ümmət idi,
Pişrəftü bəqayi-vətənü millət idi,
Cəhdimiz, hümmətimiz məktəb idi, sənət idi,
Arizu aşı bişib, dəmdədi, qazğanlamışıq,
Dəxi bəsdir, dəxi bəsdir, dəxi yorğunlamışıq.

Neçə məktəblərimiz var, neçə cəmiyyətimiz,
Zərimiz, zivərimiz, qüvvətimiz, qüdrətimiz,
Oldu bu yolda bütün sərf bizim qeyrətimiz,
Şükr, sərf oldusa da müşkülü asanlamışıq
Dəxi bəsdir, dəxi bəsdir, dəxi yorğunlamışıq.

Bitirib şəhrlərin hər cürə iş-güclərini,
Yığmışıq kəndlilərin məktəbə biveclərini,
Oğru, əyri, dələduz, giclərini, biclərini.
Can alan, qan axıdanlarını zindanlamışıq,
Dəxi bəsdir, dəxi bəsdir, dəxi yorğunlamışıq.

Bir nəfər zalıma məzlumdan olmubdu zərər,
Əğniyayə füqəradan nə olub xofü xətər,
Adət üzrə yetişib gündə bizə qanlı xəbər,
Öləni quylamışıq, öldürəni danlamışıq (!)
Gücsüzü tapdamışıq, güclünü mehmanlamışıq.

Qalmayıb bir işimizdə deyəsən zərrə qüsur,
Etmişik gözlərini düşməni-bədbinin kur.
Cümləmiz elmli, sənətli, xudavəndi-şüur
Mədəniyyət nə, tərəqqi necədir? Anlamışıq!
Dəxi bəsdir, dəxi bəsdir, dəxi yorğunlamışıq.

***Kefsiz***

## FÜRSƏT

Nə qədər dedim: bala, cavansan, özünə rəhmin gəlsin, əl çək bu qəzetdən, qoşulma bu yazıçılara, başını sal aşağa, öz kəsbü karının dalınca ol, sözümə qulaq vermədin. Mən dedikcə sən müsəlman qəzetlərini gətirdib düzdün dükanına, ötənə, keçənə dedin ki, gəlin qəzet oxuyun. Hələ səbr elədim, dedim görək, bəlkə axırda peşiman ola və öz qəbahətini annaya.

Bir gün oğlanlarım xəbər gətirdilər ki, Yəhya Hacıyev «Molla Nəsrəddin» məcmuəsinə vəkil olub. Əvvəl inanmadım, amma bazara çıxıb gördüm ki, doğrudan «Molla Nəsrəddin»i dəstə-dəstə uşaqların qoltuğuna verib satdırır. Hirsim vurdu başıma, istədim hücum edib dükanını dağıdım, amma gördüm ki, hələ vaxtı deyil, çünki qardaşlarının ikisi də dükandadırlar, bəlkə zor gələ bilmədim. Bu da belə keçdi.

---

Bir dəfə də Batumda şöhrət tapdı ki, Əhməd bəy Ağayev gəlib, gedir İstanbula və özü də Yəhya Hacıyevə qonaqdır. Ax, ay namərd, vallah, qanını sorsam, doymaram.

Amma Allah kərim Allahdır. Bir gün xəbər çıxdı ki, Yəhyanın qardaşlarının biri vəfat edib. Aha, heç dinmə, bir əli boşa çıxdı, bir qədər zəifləşdi, indi tədbir vaxtıdır. Yığdım başıma dörd oğlumu, qohum-əqrəbamı, əhva-



latı onlara bildirdim. Bir də dedilər ki, Yəhyanın o biri bəradəri də vəfat etdi. Xudaya!

Sənsən edən izlal neçə əhli-təriqi,
Sənsən edən ehda neçə gümgəşteyi-rahi.
Hökmün ki, ola mövcibi-xeyrü şəri əfal,
Yarəb, nə üçündür bu əvamir, bu nəvahi?

Bir gün övladımı, yetmiş nəfərə kimi əqrəbamı yığdım başıma. Fürsəti qənimət bilib Həmid paşa məhəlləsinə hücum etdik, Yəhya Hacıyevin üstünə. Bu mürtədi yıxdıq yerə və küçəni başabaş sürüdük. O qədər kötək vurduq ki, yarım saatadək bihal oldu.

---

Deyirlər, başına hava gəlib və gedib Tiflisə ki, özünə müalicə etdirsin.

Canı çıxsın, düz oturaydı, bu işlərə də düşməyəydi. Əlbəttə ki, günah özündədir. Məktəb işlərinə neyçün qarışırdı?

Batum, yetmiş yaşında
Dəmir oğlu Samançı.

*Nağıl elədi Lağlağı*

---

## TƏBRİZ XƏBƏRLƏRİ

Vəzarəti-cəng tərəfindən nizami-cədidə ciddi surətdə iqdam eləmək səbəbinə, tamam əyalətlərə xəbər verildi ki, hər nə şah Təhmasib zamanında qalan qobur və şamxal tüfənglər var, onların təmiratına başlasın. Bəd əz-itmam vəzarəti-cəngə xəbər verilsin.

---

Bu gün qırx nəfər heyəti-qarantin, təbiblər və sair əzaları mükəmməl idareyi-təftişiyə hifzüs səhiyyeyi-bələdiyyədən məmur olundular Azərbaycanın Rusiya sərhəddatına xoleranı cilovgirlik eləməyə. Hərgah bacarmasalar, hər sərhədə iki duziman süvarə və piyada qoşuni-nizami ezam olunacaq. Genə bacarmasalar, Mirzə Hüseyn vaiz gedəcək xolera duası oxusun.

*İmza: Kərbəlayı Kövsər*

---

## MOD

Birdən görürsən ki, Yevropa xanımları və kişiləri bildir bu cür libas geymişdilər, gələn il qeyri bir tərzdə geyinirlər. Yəqin ki, altdakı il ayrı tövr geyəcəklər. Bu qərar ilə hər il o kafərlərin arasında libasdan tutmuş bir para zadlar da dəyişilir. Buna onların içində mod deyilir. Bəzi adamlar elə anlayırlar ki, biz müsəlmanlarda mod yoxdur. Belə deyil. Bizdə də var. Bircə təfavüt budur ki, onlar bir ayrı cür edirlər, bizlər bir cür.

İnanmırsan, di qulaq as nağıl eləyim: yaxşı yadındadır ki, ta inişilə kimi bizim içimizdə teatr, qiraətxana, ianə və qeyri ehsan pulları yemək modu yox idi. Amma indi moddur, gərək yeyilsin. Qafqazın hər yerində bu tövr pullardan yeyirlər. Biri də qoy Şuşada bir nəfər bəy olsun ki, teatr pulu yeyib. Əgər mənə inanmırsan, yaz, özündən soruş. Və belə, hə yadındadır ki, bizim içimizdə müsəlmançılığa dolaşan və dinə rəxnə vuran yox idi (sünni, şiə, şeyxi, mütəşərri, babi və qeyri söhbətləri demirəm). Amma indi bir para ləməzhəblər çıxıb dinə dolaşmağı mod salıblar. Bunların hamısı belə, Qafqaz müsəlmanları mod dəyişməkdə bir azca zəifdirlər.

Bizə yetişən xəbərlərə görə, bu saat Orenburqda bir nəfər İshak İskəndərov vardır ki, müsəlman aləmini diriltmək üçün dəqiqədə maşın kimi bir cür şey törədir, əvvəl mollalara və müridlərinə nişan verib, sora camaat arasına nəşr edib mod salır. Hətta «Şurayi-islam»ı qüvvətləndirmək üçün bu günlər bir neçə qurğu hazırlayıb.

*İmza: Axmaq*

---

## ƏMİR HƏCAMƏT

Əzizim Molla qardaş, İran işlərin, xüsusən Azərbaycan işlərin istəyirsən biləsən? Heç uşaq vaxtı aşıq oynamısan? Uşaqların həvəsi gələndə bir qədər aşıq düzərlər yerə, oynarlar. Elə ki, həvəsləri getdi, hansının zoru çox olsa, aşıqları qapar, ya Əli, ya Mədət deyib qaçar, o biri aciz uşaqlar qalarlar ağlaya-ağlaya.

Mən dedim, sən bil, daha başağrısı vermə.

---

İndi gərək bu aşıqdan salarlarımız da oynadı, məşrutə və mücahidlik adı ilən Əncümən də oynadı, xülasə, işində Əli Müsyö də oynadı, mücahidlik adıyla? Bəli, yaxşı oynadılar. İndi də «Əmir həcamətin» növbəsidir. Rəhim xanın tamam qarətçi atlıları onun yanında, həm iki fövc Qaradağ atlısının rəisi, həm rəisi nəzmiyyeyi-şəhr, həm mücahid, həm qarətçi, həm lotu, həm oynayan, həm çalan, çağıran. Bu ki, aşıqları neçə dəfə qapıb qaçıb, bu səfər görək nə xəyalı var? Sorasını sizə xəbər verərik.

---

## AŞQABAD XƏBƏRLƏRİ

Ətəbatda duxovnı akademiya qurtarmış Ağayi-Şirvani əleyhissəlamın vəliəhdi Aşqabada varid oldu.

Qarabağdan da məşhur Molla Ayğır (molla Bağır) təşrif gətirdilər. Ağaların dövlətindən şəhərimiz zəmanəyə müvafiq təzə-təzə suallar ilə doludur. Məsələn, duanı plovdan əvvəl və ya sora oxumaq vacibdirmi?..

***

Rotter

Bakıda müsəlman çəkməçiləri.

Qafqazdan təzə gələn bir müsəlman

Məşhəddə Seyyid Heydəri: Çünki üzünü qırxdırırsan, mən sənə iki yüz tümən cərimə kəsmişəm, yüz doxsan tüməni sənə bağışladım, amma on tüməni bu saat verməsən, bu çubuqları belində qırıq-qırıq eləyəcəyəm.







Ağa Şeyx Səlim

Natiq: havanın istiliyinə görə əza rəy verirlər ki, Şeyx Səlim Əncümən həyatının hovuzunda çimsin.

İşqolun imtahanlarında şagirddən xəbər alırlar: «Bala! Rusca donquza nə deyirlər?» Şagird: «Svinya». «Bala, divarda təsvirini göstər görək!» Şagird axtarır. «Hazirandan Həmid bolşoy». «A köpək oğlu! Dədəni göstər dayna, odur ha divarda asılıbdır».

---

«Maderna», «Qrandviyu», «İmperial sportun» qarşısında hər gecə Hüseyn Zal, Müseyib Axund, afişaçı Aleksan və kompaniya cövlan etməkdədirlər.

---

Molla Xalera Kürdəmirdən cəmdəyini saldı Aşqabada. Deyirlər Ağa Səğər şəhərinə Orenburq yolu gedəcəkdir.

*Müxbir*

---

## HƏR GÜN

Təbrizdə rəisi-nəzmiyyə hər gün kefdə, hər gün kefdə, hər gün kefdə.

Soruşurlar ki, «Niyə belə eləyirsən? Millət əldən getdi, bir həya et».

Cavab verir ki, «Seyid Mühəqqiqinin əmisi oğluyam».

Dəxi nə deyəsən? Kişinin haqqı var.

*Həmşəri*

---

## ELAN

Hər müsəlman iranlı qardaş müqəssirlik, ya qanlılıq, ya oğruluq, ya tənbəl və biqeyrətlik səbəbinə xarici torpağında qeydi-fəlakətdə qalıb maaş səbəbinə zəhmətdədir, xəbər veririk ki, bir qədər həyanı kənara qoyub və bir də məşrutətələblik adın üstünə qoysun. İranda, xüsusən, Təbrizdə hər cür iş onun üçün fərahəmdir – Əncümən vəkaləti, rəyasəti-nəzmiyyə, rəyasəti-məhəliyyə, rəyasəti-bələdiyyə, əzayi-ədliyyə, rəyasəti-nizam, bəlkə vəkaləti-darüşşüura heç müzayiqə yoxdur. Əcələ ilə təşrif gətirsin ki, yerləri boşdur. Hətta Rəhim xan da gəlsə, gözümüz üstə yeri var.

*İmza: Cındır Xəli*

## YEKATERİNADAR XƏBƏRLƏRİ

Yekaterinadar şəhərində Mirzə Kərim xan adlı bir İran konsulu yanında olan təzkirələri satıb qurtardıqdan sora bazarı kasadlaşdığına, gətirib təzkirələrə Təbriz qaydası ilə çıraq qoydu. Bu minval ilə təzkirələr hamısı dəyər-dəyməzə satılıb qurtardı. Sora on nəfərə kimi adam təzkirəsiz qaldığından, konsul cənabları o adamlara bilet gətirmək üçün hərəsindən on manat zadatka alıb Suxum şəhərinə səfər elədi. Haman on nəfər adama bilet nə vaxt gələcək hələliyə məlum deyil. Allah salamət eləsin.

*İmza: Biletsiz*

---

## FELYETON

## MARALLARIM

Həmdi-bihəd və sənayi-biədəd bari pərvərdigara olsun ki, dünyada insanı xəlq edib və ona danışmaq üçün dil, görmək üçün göz, eşitmək üçün qulaq, fikir etmək üçün baş, işləmək üçün əl və ayaq əta edibdir. Həmdi-bihəd və sənayi-biədəd bari xudavəndə olsun ki, yer üzünü mənim marallarım ilə doldurub. Başları Hacıtərxan qarpızı, içi nə ilə dolu? Qarpız yeyib sancılanan bir şair bu barədə gözəl bir fərd deyib:

Qırxıq başın şəbahəti var çünki qarpıza,
Odur ki, həp içi dolu fisqü fəsaddır.

Qulaqlar, hər biri bir arşın, yaranıb eşitməyə. Amma nə? Mərsiyə, qəsidə, mütriblər nəğməsi, Seyid Məhəmməd moizəsi, üdəba təkfiri. Hər biri bir çatdaq boyda gözləri. Necə gözlər?! Dünyada heç zad görməyən. İki xalvar xörək tutan qarınları, sinə vuran, zəncir vuran, xəncər tutan əlləri, gecələr sübhətək ləhvü ləbə gedən ayaqları. Evlərdə gözləri yolda, əlləri qoltuqda qalan övrətləri.

Şükür olsun Allaha, yer üzündə mənim marallarımın hesabı üç yüz milyona çatıb. Gedirsən İrana, Hindistana, Türküstana, Ərəbistana, Buxaraya, İrəvana, Naxçıvana, Qarabağa, Lənkərana, Badkubəyə, Batuma, Dərbəndə, Dağıstana – hər yer mənim marallarım ilə doludur. Gözəl marallarım, göyçək marallarım, hər biri bir can marallarım! Hacı marallarım, kərbəlayı marallarım, məşədi marallarım, molla, rövzəxan, bəy, keçəl marallarım! Qotur, bitli marallarım, başları qapazlı marallarım, üzləri tüpürcəkli marallarım!

Bu marallarımın haqqında «Molla Nəsrəddin»in gələn nömrəsindən başlayıb məqalələr yazacağam. Hər maralın şənində bir dənə fərd özümdən, özgədən düzəldib deyəcəyəm. Hələ ki, xudahafiz, gələn nömrədə görüşərik. Təvəqqə edirəm qüsurumu bağışlayasınız.

*Qarelər müxlisi Heyranəli*

---

## VLADİQAFQAZ XƏBƏRLƏRİ

Konsul camaatı yığıb məscidə soruşdu: Camaat, məni istəyirsiniz, ya nə?

Camaat dedi: Nə, nə, nə, istəmirik, istəmirik, heç istəmirik.

Konsul dedi: Cəhənnəmə istəyin, gora istəyin! Pu-

lum cibimdə, ağlım başımda. Gedib Firəngistanda kefə baxaram.

1 – Başmaqçı Şəfi köhnə, qədim pullar alır çox baha qiymətə və çox ucuz qiymətə satır işqolla uşaqlarına.

2 – Mirzə Mahmud xan vaqiədə görüb ki, konsul onun məvacibini gələn ayın 39-da verəcək.

3 – Bu gün İran konsulxanasının qapısında bir belə elan oxudum: «Burada satılır: xalı, gəbə, pərdə, millət, vətən, stul, kürsü, flan və flan». Öz-özümə dedim ki, mərhəba belə konsula, yeddi ayın müddətində Vladiqafqaz müsəlmanlarının işlərini cabəca edib, indi də yəqin ki, gedir özgə şəhəri abad etməyə.

Konsul cənablarının gördüyü işləri xəyalımda hesabladım, gördüm həqiqətdə çox işlər görüb. Məsələn, bu az müddətdə «Novruz» mədrəsəsinin tərəqqisi üçün 25 məclis qurub və 8625 manat 12 qəpik də pul cəm edib, Əncüməni-xeyriyyəni nizama salıb və ittihad məsələsi üçün 45 məclis tərtib verib. Əlavə bir neçə min də bilet satıb, bərayi-ehtiyat səfər üçün beş-on qara pul toplayıb.

Ay Molla əmi, fikir eləyirəm dəxi bir adam yeddi ayda bundan artıq nə iş görə bilər? Bu misranı qapıya yazıb getdim:

Ağa konsul, ola üzün sənin ağ,
Millətin sinəsinə çəkdin dağ.
İtirəydim sənin tək ağanı,
Gecə-gündüz gəzəydim əldə çırağ.

*Qəmişqulu*

---

## NAXÇIVAN

«Etidaliyyun» firqəsini camaata tanıtmaq üçün Sipehdar tərəfindən üç nəfər fars seyid buraya gəlibdir. Ağalar varid olduqları gündən bazar camaatından seyidmalı yığmaqdadırlar.

---

Seyid Abdullanın qətl xəbəri bura xuliqanlarını düçari-yas etdi. Məqtulun təziyəsi münasibətilə məşrutəçilərə bir aya qədər gündə bir təsbeh, yəni yüz dəfə lənət eləmək təhti-qərara alındı.

---

Ay Molla əmi! Elə sən ha deyirsən ki, mən hər zadı bilirəm. Amma nə əcəb bəs bir ildi ki, Qarabağlara imamdan bir az artıq, peyğəmbərdən bir mıxça aşağı bir molla gəlib camaatı öz imamlığına çağırır və hələ Naxçıvan qazisi də ondan tir-tir əsir, heç onu bilmirsən?! Əgər onun mənzilin bilmək istəsən, Qarabağlardır, özü də mənim evimdə. Teleqraf ünvanı «Hürr».

---

## AĞAYİ-MÜQƏDDƏS

Müxtəsəri əz-tarixe-zendeqaniye-ağaye Seyyid Nəsrullah Əxəvi vəkile-məclise-şoraye-milliye-İran və eqdamati ke, dər rahe-məşrutiyyət və azadiye-İran nəmude başəmmei əz-məlumate-vey

(Təhsilat)

Elme-əruz və şairi, elme-nəğayət, elme-osul, hikməte-ilahi, elme-orfan.

(Pişe və herfe)

Vəkalət, siyadət, əxəvi, ağac, cəhl və yek minbər, şəm dozdi, xordəne kitabxaneye-melli, foruxteye-zəminhaye moqufə ke dər poştxaneyi-Eynəddoule vaqe əst. Zəbt və təsərrofe-molke-moqufə mousem be (vasihan) ke dər ləvasan vaqe əst. Bəl əmlake moqufiyyeye bazare zərgəran və bəzi dəkakin.

(Eqdamati ke dər pişrəfte-məşruteye-əvvəle-İran kərde)

Təsise Əncomən şəst nəfər dər məclis, inşai-əsl dovvomo bisto həftomo mottəmime-qanune-əsasi, təşkile houzeye elmiyye dər məcles, təyine pənc nəfər tərrazi əvvəliülləma dər məclis, mən əz qəte hoquqe moftəxoran dər komissione maliyyeye-məcles, israr dər bərqərariye-titul bər gəşt kərde. Bəhəm rahi dər oudəti–Əli Əsğər xan əz firəng be Tehran və nişandənəş bəməsnədi–sədarət bevasiteye Əncomən şəst nəfəri və və və, təhrike-şeyxe Nuri be bərdaştən elme estebdad və rəftəne bəhəzrəte Əbdoləzim və və və...

(Əcazü xarici adət)

Gər şəfa dadən, təsxire Əli Əsğər xan sədre-əzəm.
Ey Ətabək noxbeye asari eşq.
Kon ze huşət baxəbər in dəm məra dəmdəm məra.

*Tiryak*

---

## POÇTA QUTUSU

Nuxada «Sakini-Kərazlı»ya: Adsız kağızı heç oxumuruq.

---

Məzrəə kəndində «Bir nəfər oxucu»muza: Məktubunuz yüz sətirdən ibarətdir, amma Məzrəə kəndinin işlərindən tək bircə sətirdən artıq yazmağa haqqımız yoxdur. Sahibi-ixtiyarsız.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

---




Çaxırxanə.

8 şaban 1328 **Beşimci il** 1 августа 1910 г.

# ملانصرالدين

№30 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 30




Padşahlıq dumanın tәzә qәrardadı.
Qaradovoy: Bu gün bazardır, gәlin mәscidә, gәlin mәscidә!..
Гарадовой: Сегодня воскресенье, пошелъ въ мечеть!

Litoq. S.Bıxova

## ƏDƏBİYYAT

### AY CAN, AY CAN

Düşdü bütün qəzetlər hörmətdən, ay can, ay can!
Xəlqin canı qurtardı töhmətdən, ay can, ay can!

---

Qıl yaymayırdı əsla zalımların gözündən,
Rüsvay idik cahanda məlunların sözündən.
Ax, ax! Nə yaxşı oldu, iş düşdü öz-özündən,
Əlləşməmiş qurtardıq zəhmətdən, ay can, ay can!
Düşdü bütün qəzetlər qiymətdən, ay can, ay can!

---

Badi-səba, apar ver Molla Qəvamə müjdə,
Yazsın de Lənkəranda Molla Səlamə müjdə.
Söylə o da yetirsin yeksər əvamə müjdə,
Minbərdə rəqsə gəlsin behcətdən, ay can, ay can!
Düşdü bütün qəzetlər hörmətdən, ay can, ay can!

---



Ərz et bəşaşət ilə Qafqazdakı vücudə,
Jurnal, qəzet qapandı, durma yığıl sücudə.
Hər nə bilirsən, eylə, qeybətdə, rubərudə.
Yazmaz dəxi yazanlar bidətdən ay can, ay can!
Xəlqin canı qurtardı töhmətdən, ay can, ay can!

---

Get Qubaya, salam et Molla Hacı Babaya
Söylə tutuldu cümlə jurnal-qəzet vəbaya.
Mömin müridlər ilə dur qoş səda-sədayə.
Ümmətlərin yığılsın hər kənddən, ay can, ay can!
Düşdü bütün qəzetlər hörmətdən, ay can, ay can!

---

Yatdı yazı yazanlar, fürsət dəxi sizindir.
Qarşıda var orucluq, söhbət dəxi sizindir.
Məclisdə minbər üzrə lənət dəxi sizindir.
Ayrılmayın ölüncə lənətdən, ay can, ay can!
Düşdü bütün qəzetlər hörmətdən, ay can, ay can!

..........

---

## İNNA LİLLAHİ VƏ İNNA İLEYHİ RACİUN*

Neçə gün bundan qabaq şəhərimizdə bir vücudi-möhtərəm, təbibi-haziq və həkimi-məşhur Hacı Mirzə ağa həkimbaşı dari-bəqadan dari-fənaya rehlət buyurduqlarından əhalimizə tükənməz bir ələm və bitməz bir qəm üz veribdir ki, yazmaq ilə bəyana gəlməz. Xüsusən bu vücudi-mübarəkin belə bir zamanda ki, hər tərəfdən xolera sədası gəlir, əhalini təbibsiz, sahibsiz buraxıb getməyi nə qədər şayani-təəssüf olsa becadır. Qareini-girama bu zati-möhtərəmin vətənə və millətə etdiyi xidmətlərini təqdim ilə mərhumun tərcümeyi-halını yazmağı mənfəətdən xali bilmirəm.

Mətəvaffa əslən Danabaş kəndindən olub səfərül-mürəccəbin 32-sində səneyi-hicriyyənin 1269 ilində öz anasından təvəllüd tapmışdır. On yaşına çatana kimi validəyi-mükərrəməsinin təhti-tərbiyətində bulunub on yaşını keçdikdə şəhərimizin Zaviyə məscidi məktəbinin ibtidai sinfinə daxil olmuşdur. On ildən sora haman məktəbi qurtardıqda Şəril mahalına gedib «İtqıran» adınlı kənddə bir aptekə (davaxana) açıb şivərən, səna, həlilə, mürdəsəngə və qeyri bu cür davalar satmaq ilə təbabətə də başlayıb bir neçə ilin müddətində İtqıran camaatını qırıb qurtarmaq ilə təbabətdə təcrübə hasil edir və sora davaxananı bir xurcuna doldurub səyyar təbib olub mahalı gəzməyə başlayır. Dəxi böyük təcrübələr hasil etdikdən sora qeyri məmləkətlərə səyahət etmək sövdasına düşür. Bu qəsd ilə Culfa təriqi ilə İrana keçib, Xoy və Səlmas mahalını dolaşdıqdan sora özünü Urmiyə salır. Yetişən kimi ora qəzetələrinə gəlməyini elan verib həkimliyə başlayır. Bir az müddət içində müşarüleyhin yadigarı üçün «Qaraağac» məhəlləsində «Qəbristani-Hüseyniyyə» adınlı bir məzarıstan bina olunur. Bu aralıq şəhərimizdə bir şəxsə borcu olduğu üçün haman şəxs konsula şikayət edir və konsul cənab həkimi tutub təhtülhifz Təbriz təriqiylə vətəninə göndərir. Ancaq bəxtin gətirməyindən şikayət edən şəxs şəhərdə olmur. Və həkim cənabları fürsətdən istifadə edib İrana fərar edir. Bundan sora Kərbəlaya getmək fikrinə düşür. Binavü Xanəqah təriqilə Kərbəlayi-müəllaya gedir. Orada Kərbəlayi Həsən adıyla məruf olur. Kərbəlada bir qədər qaldıqdan sora oradan Hacı olmaq sevdasıyla Məkkəyə azim olub və Həccin qeyri-mövsümündə Məkkənin yanından ötdükdə səmum yeli mərhumun burnuna dəyib Hacı Mirzə Həsən ismilə məşhur olur. Oradan Bəsrəyə və Bəhreyn şəhərlərinə gəlib əhaliyə tədavidə bulunur və hətta Bəsrə şəhərində gedib dəryanın «cəzr»ü «mədd»ində tədqiq və təhqiq etməyilə kəşfiyyat aləminə böyük bir xidmət göstərir. Və haman vaxtlarda gecələrin birisində yuxuda Kəlküttə şəhərinə gedib «antipirin» və «aspirin» sözlərini öyrənib Yevropa üsulundan da xəbərdar olur. Axırda, 1318 səneyi-hicridə vətənini və oranın zavallı əhalisinin fəlakətli halını nəzərə alıb da tərki-qürbət etməyi müqərrər edir və Kirmanşahdan keçən zaman orada olan həmşəhrisi Hacı Həsəndən üç yüz tümən pul alıb əvəzində bir bəstə hifzüssəhiyyə kitablarından qoyub gəlir. Şəhərimizə varid olduqdan sora həkimliyə başlayıb çox naxoşları dünya məşəqqətindən xilas edir və buna iktifa etməyib sənaye ilə də övladi-vətənə xidmət edib, barama qoyur və hətta erməni-müsəlman iğtişaşında ermənilərin malını qarət etməyilə millətinə böyük xidmətlər göstəribdir. Bu minval ilə bu 1328 sənənin cəmadiyəl-axır ayının axırlarına qədər öz xədəmatilə millətini bəxtiyar edirdi. Ancaq bu rəcəbül-əvvəl ayının ikisində əqrəbalarından birisinin evində qonaq olub yağlı plov yeyib əhvalı mütəğəyyir olur. Bir qəlyan istəyib çəkdiyi əsnada «təzə cavanlar hamısı laməzhəbdirlər və lüləyinə etiqadları yoxdur» dedikdə ficətən vəfat edir. Mərhumun axırıncı sözləri nə qədər ibrətamiz olsa səzadır. Allah həkimbaşıya rəhmət edib baqimandələrinə səbri-Əyyubi əta etsin. Amin!

*Qəmlərinizə şərik: Uzun Abas*

*Quran ayəsidir. Tərcüməsi: Doğrudan da biz Allahdanıq və ona qayıdacağıq. *(red. – T.K.)*

## NAXÇIVAN

Hər gün saat ondan on ikiyə kimi Naxçıvanda Qapan dibində, meydanda olan dükançılardan növbət ilə bir nəfər iranlı hammalı başına küpələr ilə su töküb insana artıq dərəcədə ləzzətverici tamaşalar göstərirlər. Tamaşa müftədir. Ancaq gələnlərdən xahiş olunur ki, uzaqdan durub yerdən qarpız və qovun qabığı və ya əllərinə hər nə keçirsə götürüb haman hammala atsınlar.

Naxçıvan – gömrük qabağının mücaviri bir nəfər bəy tək qalıb başı şişdiyindən nəzir edib ki, yaylağa getmiş bəylər tez qayıdıb gəlsinlər, «Nuhdaban»da bir dənə şam yandırsın. Çünki bir aydan artıqdır bir elə adam tapmır ki, onların yanında camaatın qeybətini edib və qəzetə yazanları söysün. Bu səbəbə odur ki, bəyə və yanında olan bir nəfər ağaya da bu ovqat çox dilxorluq keçir.

*İmza: Nəçəndan bəy*

## SÖHBƏT

Biletsatan – Salam əleyküm, Hacı, bir bilet al, teatr oynayırıq.

Hacı – Əleykümessalam. Balam, zərər-ziyanımız azdır ki, bir də 2 manat, 3 manat verib bilet alaq?

Biletsatan – Hacı, Göynükdə olan seylabdan ianəyə möhtac olan qardaşlarımızın mənfəətinə oynayırıq. Allahı sevirsən bir bilet al. Ermənilər dünən oynayıb üç yüz manat pul alıb öz aclarına göndəriblər.

Hacı – Mən erməni deyiləm şeytan karxanasına pul verim.

Biletsatan – Ay Hacı, bəs sən bilet almayanda kim alsın?!

Hacı – Mən nə bilim, hər kəs istəyir alsın, mən ala bilmərəm!

Biletsatan – Allah sənin kimi Hacıları çox eləsin, xudahafiz.

Bir qeyrisi – Ay Hacı, dərviş oxuyur, bir abbası ver.

Hacı – Ux, dərvişin dərd-bəlası gəlsin teatr oynayanların canına. Al bir manat verim.

*İmza: Çayqırağlı*



Məkkəyə gedəndə. Въ Мекку

Rotter

Məkkədən qayıdanda. По возвращении.

## İNDİ BAŞA DÜŞDÜM

Yaxşı yadıma gəlir ki, uşaq vaxtında cümə axşamları anam ilə bərabər və sair qonşu övrətlər ilə məhəlləmizə yaxın olan «Xədiceyi-kübra» pirinə şam yandırmağa gedərdik. Hərdənbir mən orada urusların da şam yandırmağını görürdüm, xırda olduğumdan ağlım bir zad kəsmirdi və bu işi anamdan da heç xəbər almırdım.

İndiyə kimi də elə hərdənbir bu iş yadıma düşəndə fikirləşirdim. Dünən «Kaspi» qəzetinin xırda xəbərlərinə göz gəzdirəndə gördüm yazıb ki: «Bakıda və ətraf kəndlərində xristian malakanları xoleranın qabağını almaq üçün müsəllaya çıxdılar». Elə bu xəbəri görcək «Xədiceyi-kübra» pirinə şam düzən uruslar yadıma düşdü. Tez başa düşdüm ki, onlar da biz müsəlmanlar kimi müsəllaya, pirə inanırlar. Xülasə, bir az rahat oldum.

Amma görəsən təzə çıxan müsəlmanlar və malakanlardan savayı xaricilər canlarını hara qoyacaqlar?

*İmza: Lavaşaçan*

## NUXADA TEATR

Bazar məktəbində teatr oynanacaqdı. Teatr elanını çap etməyə mətbəələrdə macal olmadığından əl ilə yazmışdılar. Biletlərdən o qədər satılmışdı ki, hamısı qalmışdı. Axşamçağı tamaşaya gələnlərdən bir neçəsi yubandığına, onları xəbərdar etməkdən ötrü teatr damına bir dəstə zurnaçı çıxartdılar. Xülasə, teatr başlandı. Ancaq burası var ki, içəridə hərə öz yerində sakit və samit oturub tamaşaya məşğul idi. Özgə şəhərdərdəki kimi qanunsuzluq filan yoxdu. Teatrdan cəm olan pulu, belə nağıl eləyirlər ki, Göynük kəndinin sel zərər vurduğu aclarına verəcəklər. Hesabın surətini təfsil üzrə sora yazaram.

*Tamaşaçı*

## TƏBRİZ XƏBƏRLƏRİ

Həzrət Mirnağı Qılınc ağa Təbrizdə iki istəkanı bir şahıya çay satmaqdan təngə gəlib. Seyidmalıda o qədər vermədilər ki, onun ömrü keçsin, biçarə labüd qalıb mücahid oldu. Müddəti-mücahidətində ətək-ətək pullar alıb atlar mindi, keflər çəkdi, evlər yıxdı, axırda beş yüz tümən dinmə, ver pulu alıb cəddi-büzürgüvarını könlü istədi. Azimi-Kərbəla olub bəzi üləma və mücahidlərin xidmətinə yetişib və onlara qərar verib ki, bir müddət də şəriət işlərinə kömək eləsin. Ona binaən üləmadan hökm alıb, azimi-Tehran olub, Tehranda Bağır bənna cənabları ilə əl-ələ verib şəriətə kömək elərlər. Bu günlərdə ultimatum veriblər ki, hər nə başlı adam var, başların dibindən qırxdırsınlar. Bu komitənin bir şöbəsi də Təbriz Əncümənindədir, onların rəisi Mirzə Hüseyn Məktəbdardır.

*Zurnaçı*

***Felyeton***

## MARALLARIM

Qasım əmi, dur qapını cəftələ,
Qorxum odu adım düşə dəftərə.

Mən gələn məqalələrimdə heç maralların adını yazmayacağam, çünki hər maralım özü-özünü tanıyacaq. Qarelər içində bu adların bir elə əhəmiyyəti yoxdur: maralın adı istəyir Ramazan, istəyir Şaban, istəyir Səfər, istəyir Rəcəb olsun, qare üçün bir təfavüt etməz, ancaq maral olsun. Bu maralımın adı hərçənd Qasım əmidir, amma Qasım əmi bir maral deyil; neçə yüz, bəlkə neçə min maralı yığıb, bir yerdə yoğurub içindən bir maral çıxardıb adını Qasım əmi qoymuşam.

Qasım əmi kənddə əvvəlinci şəxsdir, neçə il yüzbaşılıq edib, axırda bir nəfər şəxs bunun üstünə şər atıbdır ki, guya Qasım yüzbaşı rüşvətxordur. O səbəbə möhrünü və zəncirini əlindən alıblar. O da ki, görüb onun haqqında belə zülm oldu, acıq ilə götürüb, qulluqdan çıxandan qabaq bir üç yüz təbəqə ağ kağıza möhür basıb; indi də o kağızlardan düşəndə təbəqəsini üç manatdan, beş manatdan satır. O kağızları alıb üstünə köhnə tarixdən onun-bunun adına veksildən, icarənamədən, filandan yazırlar. Mətləbdən uzaq düşdük. Bəli, Qasım əminin kənddə artıq ehtiramı var; ondan məsləhətsiz heç iş kənddə görülməz. Bu dəfə genə camaat Qasım əmini əhatə etmişdilər; bildim ki, bir mühüm məsələ müzakirə olunur, gəldim yavığa, gördüm Qasım əmi bir daş üstə əyləşib deyir: «Camaat, biz indiyə kimi dövlətin heç bir əmrindən baş qaçırmamışıq, ğezel pulu vermişik, tüstü pulu vermişik, dinməver pulu vermişik, biyara buyurublar getmişik. Amma indi bir dəftər götürüb veriblər bizim mollaya, deyirlər ki, hər nə ki, kənddə uşaq anadan doğuldu gərək adı bu dəftərə salınsın: dəftərin də adına «mütrib dəftəri» deyirlər. Qardaş, bizim uşaqlarımızın adlarının dəftərdə nə işi? Sabahdan da gələcəklər, gəlin, arvadlarınızın adlarını yazdırın.

Canım, urusun biri niyə mənim arvadımın adını bilsin? Doğrusu, biz bu «mütrib dəftəri»ni qəbul edə bilməyəcəyik. Buna dovşanı araba ilə tutan urus deyərlər. Bu gün uşaqlarımızı dəftərə yazacaq, bir neçə ildən də sora gəlib hamısını yığıb saldat aparacaq. Doğrusu, biz «mütrib dəftəri»ni qəbul eləməyəcəyik.

Mən yeridim qabağa, dedim: Qasım yüzbaşı, bu qayda hər bir dövlətdə var, uşaqların adlarını metrik dəftərinə salırlar ki, lazım olan vaxt hər birisinin yaşı məlum olsun.

Elə bil Qasım əmiyə bir güllə dəydi; qalxdı ayağa, hirsli əlini döşünə çırpıb dedi: «Mən özüm «mütrib dəftəri», hər kəsin sinnini bilmək istəyirsiniz, məndən soruşun. Bax, bu uşaq – Qarğa Mələyin nəvəsidir, Gün batan ili anadan olub. Bu uşaq – İlan qırxan Səftərin oğludur, bu da çəyirtkə gəlib bizim taxıllarımızı tərk eləyən ili anadan olub. Bu uşaq – Pişiksatan Allahverdinin nəvəsidir, bu da Novruz bayramı ilə aşura bir günə düşən ili anadan olub. Bu uşaq – Balıqudan Pirverdinin nəvəsidir, Eşşəkçi Aslan tut ağacından düşüb ölən ili anadan olub. Daha kimi soruşursunuz deyim. «Mütrib dəftəri» niyə lazımdır?»

– Qasım əmi, sən özün hansı ildə anadan olmusan?

– Xaşal Qurbanı sel aparan ili.

*Ceyranəli*

## TELEQRAF XƏBƏRLƏRİ

Batum – İslam aləmi üçün xüsusi qəhvəxanalar açmışıq. Qəhvəxanamızda təzə nərtaxta, domino və gəncəfə hazırdır. Müştərilərdən təvəqqe edirik buyursunlar qəhvəxanaya, sübh gün tülu edəndən ta gecə hökumət dükanları bağladanacan. Müştərilərin acıqları tutmasın qəhvəxanamızın bağlanmasına. Əgər mümkün edə bilsəydik illər ilə bağlamazdıq. Həmişə oyuna məşğul olardıq.

*İmza: Tənbəl*

---

Aşqabad – Mərvdə bir nəfər övrət bərk naxoş olub. Yuxuda buna deyiblər ki, gərək sənin namazını Aşqabad alimi Seyid Məhəmməd axund qalsın. Dünən Mərvdən gecə ilən teleqraf gəlibdir ki, axund təşrif aparsın. Axund cənabları təşrif apardılar Maksim Qorki ilə Mərvə (4-cü klas vaqonlar ilə). Amma öz diakonu Molla Yeqoru aparmadı.

*Dostunuz: At oğrusu*

---

Batum – Ramazan ayı yaxınlaşdığından şəhərin hər yerində olan «Dombala» oyununun kağızlarını təzələməkdən ötrü fabrikalara yüz min düjün kağızlardan zakaz verildi. Batum müsəlmanları yeddi yaşdan yetmiş yaşına kimi bu oyunu Ramazan gecələri oynayırlar. Hər kəs bu oyunu oynamazsa onun oruc-namazı da qəbul olunmaz. Bu səbəbdən cəmi Qafqaz müsəlmanlarına yazıb xəbər edirik ki, onlar da bu savabdan məhrum olmasınlar.

### NUXADAN ELAN

Kar Cabbarın bağını icarəyə tutmuşam, hər cür oyunlar, məsələn, asnas, vertuşka, baqara və qeyriləri mövcuddur. Kart kağızı almaq üçün bazara getmək lazım deyil, çünki bağda kağız da satıram. Bağ haqqı isə yer pulundan alıram. Seylabdan dağılan migidançı dükanlarının əvəzində isə bura xeyli xəlvətdir.

*Adresi: Kar Cabbarın bağında Tülək Seyid*

## AŞQABAD

Bu il Buxarada sünni və şiə davası mövcibi ilə rus rəiyyətlərinə əmir tərəfindən 22 min manat pul verildi. İran təbəələrinə isə rus təbəələrindən ziyadə ziyan çatmışdı. Amma biçərələrə bir qəpik də verilmədi. Çünki bunlar heyvan hesabındadırlar. Genə də heyvanın sahibi çobandır, bunların çobanı da yoxdur ki, haqlarını istəsin. Hardasınız ay konsullar? Ay naiblər! Ay naib konsullar! Ay səeyyidülvüzəra! Ay İshaq xan! Ay Vəzirzadə! Ay Çornı qorod naibi aşpaz Hacı Məhəmməd bəy naib! Ay konsulları təyin edən (konsul zavodu) müşavirül-məmalik! Məgər xəbəriniz yoxdur? Nə düşmüsünüz biçarə rəiyyətə başburt satmağın dalınca? Məgər bu təzkirə alış-verişindən yorulmadınız? Rəiyyəti soymaqdan usanmadınız? Bəs bu biçarələrin imdadına çatmaq kimin borcudur?

*Müxbir*

---

## POÇTA QUTUSU

Göyçayda «Müxbir»imizə: «İqbal» məktəbinin gözəl surətdə yaşayıb və işlərini qaydasınca aparılmağından ağlım bir şey kəsmir.

---

Naxçıvanda «Şitil» imzasıyla yazana: Yazırsan ki, dünən bazarda bir müsəlman bir nəfər rus xanımını hər gecə evindən savayı getdiyi yerdə olan məhbubəsinə oxşadıb ürəyi getdi. Bu bir elə iş deyil, sən Ordubad şəhərində axşam çağları «Körpü başı»na bax.

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

## ELANLAR

### ELANİ-CİDDİ

27-ci nömrəmizdə olan şəkil ki, altında cavan babilərə töhfə yazılmışdı, Aşqabadda həmişə sakin olan bir nəfər tacirin surətidir.

Nuxada teatr. Мусульманскии театръ въ гор. Нуха.




Çünki biletlər satılmadı, üç dəstə zurnaçı gətiriblər ki, xalq xəbərdar olsun.